## DÖRDÜNCÜ NƏŞRƏ MÜQƏDDIMƏ

Aləmlərin rəbbi Allaha həmdü-səna olsun! Allah, Ondan qorxan müttəqi bəndələrə xoş aqibət bəxş etsin, zalımların qisməti yalnız ədavət olsun!

Allahın insanlara mərhəmət ifadəsi olaraq göndərdiyi peyğəmbərimiz Məhəmmədə (Ona və ailəsinə Allahın salavatı və salamı olsun! - s.ə.a.s.) ən tam və ən kamil salavat və salam olsun!)

Bu, "Tövhidə dəlillərə dair faydalı söz" kitabımın dördüncü nəşridir. Son nəşrdən sonra onu bir daha nəşriyyata təqdim edirəm.

Əzəmət və kəramət sahibi Allahdan Onun gözəl adları və sifətlərilə bu əsəri Öz mübarək camalına layiq bilməyi, Öz mərhəmət və kəramətilə Yer üzünün hər yerində müsəlmanlara xeyir və bərəkət bəxş etməyi arzu edirik. Həqiqətən Rəbbim duanı eşidəndir. O hər şeyi öz yerinə qoymuş, nizamlamış və tərtib etmişdir. Mən Allahdan mənə və mömin qardaşlarıma faydalı elm, yaxşı əməl qismət etməyi, bizi Cənnətə sakin etməyi, Cəhənnəmdən də uzaq tutmağı arzu edirəm.

Peyğəmbərimiz Məhəmmədə və ailəsinə salavat və salam olsun!

Əbu Ibrahim
Yəmən, 01.01.1411 h.

## "LA İLAHƏ İLLƏLLAH"-ın mənası

Yəni Allahdan başqa ibadət haqqına malik məbud yoxdur. Allahdan qeyrisinə edilən ibadət batildir.

Allah-təala buyurur:

"Bu belədir, çünki Allah haqq, müşriklərin ondan başqa ibadət etdikləri (bütlər, tanrılar) isə batildir. Həqiqətən Allah (hər şeydən) uca və böyükdür!" (əl-Həcc: 62). (Mübarək ayələrin tərcümə-sində Z.Bünyadov və V.Məmmədəliyevin müvafiq tər-cüməsindən geniş şəkildə istifadə edilmişdir - Z.Q.).

"Bu (deyilənlər) ona görədir ki, Allah haqq, (müşriklərin) Ondan qeyri ibadət etdikləri isə batildir. Həqiqətən Allah (hər şeydən) uca və böyükdür!" (Loğman: 30).

"Bil ki, Allahdan başqa tanrı yoxdur" (Məhəmməd: 19).

## "MƏHƏMMƏD RƏSULULLAH"-ın mənası

Yəni Ona və ailəsinə Allahın ən gözəl xeyir-duası və salamı olmuş Allah peyğəmbərindən başqa itaət haqqına malik olan yoxdur! Dəlil olmadan Allahın peyğəmbərindən - səllallahu əleyhi və səlləm - qeyrisinə edilən itaət batil itaətdir.

Allah-təala buyurur:

"Rəbbinizdən sizə nazil edilən Qurana tabe olun. Allahı qoyub başqa havadarlara uymayın. Siz öyüd-nəsihətə olduqca az qulaq asırsınız!" (əl-Əraf: 3).

"Yox, (Ya Məhəmməd!) Allaha and olsun! Onlar aralarında baş verən mübahisələrdə səni hakim təyin etməyincə, verdiyin hökmlərə görə öz nəfslərindən sıxıntı duymayınca və sənə tam şəkildə itaət etməyincə iman sahibi olmazlar" (ən-Nisa: 65).

"Allah və peyğəmbəri bir işi hökm etdiyi zaman heç bir mömin kişiyə və qadına öz işlərində başqa yol seçmək (ayrı cür hərəkət etmək) yaraşmaz. Allah və Onun Peyğəmbərinə asi olan kəs, şübhəsiz ki, haqq yoldan açıq-aydın azmışdır!" (əl-Əhzab: 36).

## ALLAH HARADADIR?

Allah-təala buyurur:

"Rəhman ərşə yüksəldi" (Tahə: 5).

Allah-təala həmçinin Qurani-kərimdə yeddi yer-də bu sözləri buyurur:

“...sonra ərşə yüksəldi...”
1. əl-Əraf: 54-cü ayə;
2. Yunus: 3-cü ayə;
3. ər-Rədd: 2-ci ayə;
4. əl-Furqan: 59-cu ayə;
5. əs-Səcdə: 4-cü ayə;
6. əl-Hədid: 4-cü ayə.

Mübarək ayələr:
Allah-təala həmçinin buyurur:
“O Öz qulları üzərində hakimi-mütləqdir. O, hikmət və bilik sahibidir” (əl-Ənam: 18).
“Allah öz bəndələri üzərində hakimi mütləqdir. O sizə (yaxşı və pis əməllərinizi) yazan, sizi Şey-tandan qoruyan gözətçi mələklər göndərir. Nəhayət, birinizin əcəli gəlib çatdıqda onun canını (gön-dərdiyimiz) mələklər alar. Onlar (öz vəzifələ-rində) heç bir əyər-əskikliyə yol verməzlər!” (əl-Ənam: 61).
“Onlar öz fövqlərində olan Allahdan qorxar və özlərinə buyurulanları edərlər” (ən-Nəhl: 50).
“Hər kəs (dünyada) izzət-qüdrət, şərəf-şan is-təsə, (bilsin ki, dünyada da, axirətdə də) bütün iz-zət-qüdrət, şərəf-şan ancaq Allaha məxsusdur. (Bu-na yalnız Allaha itaət və ibadət etməklə nail ol-maq mümkündür). Pak söz (tövhid kəlməsi, zikr, həmd-səna) Ona tərəf yüksələr və pak sözü də (Allah dərgahında) yaxşı əməl qaldırar. Pis əməllər edənləri şiddətli bir əzab gözləyir. Onların qur-duqları hiylələr boşa çıxar” (Fatir: 10).

Hədislər:
1. Əbu Hüreyrədən (Allah ondan razı olsun!) rəvayət olunur ki, Peyğəmbər (s.ə.a.s) demişdir: “Allah canlı varlığı yaradanda Ərşin üstündə, Onun dərgahında olan kitabda yazmışdır ki, mər-həmətim qəzəbimə üstün gəldi” (Qaynaqlar: Buxari, “Xilqətin əvvəli” 4/73; “ət-Tövhid, 8/176, 216. Müs-lim, “ət-Tövbə”, 412107).
2. Müaviyə ibn Həkəm Səlmi (Allah ondan razı olsun!) demişdir: “Bir cariyəm var idi. Ühüd və Cə-vaniyə arasında çöldə qoyunlarımı otarırdı. Bir gün canavar bir quzunu aparır. Mən bir insan kimi bu itkiyə çox təəssüfləndim, hətta onun üzünə bir sillə də vurdum. Bundan sonra Rəsulullahın (s.ə.a.s) yanına gəldim. Hiss etmişdim ki, nahaq iş görmüşəm. Əhvalatı ona danışdım. O mənə dedi ki, böyük bir günah etmisən. Mən soruşdum: “Ya Rə-sulullah, onu azad edimmi?” O mənə dedi: “Onu ya-nıma gətir”. Hər ikimiz Peyğəmbərin (s.ə.a.s) ya-nına gəldik. Ondan soruşdu: “Allah haradadır?” Cariyə dedi ki, səma üzərindədir. Soruşdu ki, “Mən kiməm?” Dedi: “Sən Allahın Peyğəmbərisən”. Bundan sonra Rəsulullah (s.ə.a.s) mənə dedi: “Onu azad et. O, mömindir” (Qaynaq: Müslim, “Məscidlər və namaz yerləri kitabı”, 1/382).

## İSLAMIN TƏRİFİ

İslam Allaha tövhidlə təslim olmaq, Ondan itaətlə asılı olmaq, şirk, bidət, müşrik və bidətçilərdən xilas olmaq deməkdir.
Allah-təala buyurur:
“Allah dərgahında (məqbul olan) din, əlbəttə, Islamdır. Kitab verilmiş şəxslər (yəhudilər və xristianlar) ancaq (bu dinin həqiqi olduğunu) bildikdən sonra aralarındakı paxıllıq ucundan ixtilafa başladılar. Allahın hökmlərini inkar edən şəxslə, şübhəsiz ki, Allah tezliklə haqq-hesab çəkəcəkdir” (Ali-Imran: 19).
“Bu gün dininizi tamamlayıb mükəmməl etdim, sizə olan nemətimi başa çatdırdım və bir din kimi sizin üçün Islamı bəyənib seçdim”(əl-Maidə: 3).
“Tövbə edib Rəbbinizə dönün. Əzab sizə gəlmə-mişdən əvvəl Ona təslim olun. Sonra sizə heç bir kömək olunmaz” (əz-Zumər: 54).
“Rəbbi Ibrahimə “(Əmrimə) təslim ol!” dedikdə, Ibrahim də Aləmlərin Rəbbinə “Təslim oldum (mü-səlman oldum!)” deyə cavab vermişdi. Ibrahim və Yəqub bunu öz oğlanlarına vəsiyyət edib, hər birinə dedi: “Ey oğlanlarım, həqiqətən, Allah sizin üçün (belə bir) din (Islam dini) seçdi, siz də ancaq müsəlman olaraq ölməlisiniz!”(əl-Bəqərə: 131-132).
“Ey iman gətirənlər! Allahdan lazımınca qorxun! Yalnız müsəlman kimi ölün!” (Ali-Imran: 102).
“Necə ola bilər ki, onlar (kitab əhli) Allahın dinindən başqa bir din axtarsınlar? Halbuki göy-lərdə və yerdə olanların hamısı istər-istəməz Ona təslim olmuşlar və Onun hüzuruna qayıdacaq-lar” (Ali-Imran: 83).

"Kim Islamdan başqa bir din ardınca gedərsə, (o din) heç vaxt qəbul olunmaz və bu şəxs Axirətdə zərər çəkənlərdən biri olacaqdır" (Ali-Imran: 85).

## ISLAMIN BEŞ DAYAĞI

Abdulla ibn Ömərin (Allah onlardan razı olsun!) rəvayətinə görə, Peyğəmbər (s.ə.a.s) demiş-dir: "Islam beş dayaq üzərində qurulmuşdur: "La ilahə illallah və Mühəmməd Rəsulullah" şəhadəti, namaz qılmaq, zəkat vermək, Kəbəyə həcc ziyarəti və Ramazan orucu" (Qaynaq: Buxari, "əl-Iman" əsəri, 18; Müslim, "Iman" əsəri, 1/45).*

## IMANIN TƏRIFI

Iman - dillə deyilən, qəlblə inanılan və bədən üzvləri ilə əməl ediləndir. Itaət imanı artırır, asiliksə azaldır.

## IMANIN ALTI DAYAĞI

Müsəlman qardaşım! Bil ki, Allah-təala məni və səni sevdiyi və razı qaldığı bir şeyə müvəffəq et-mişdir. Peyğəmbər (s.ə.a.s) Cəbrayılın iman barə-sində sualının cavabında demişdir: "Iman Alla-ha, Onun mələklərinə, kitablarına, peyğəmbər-lərinə, Axirət gününə, qəzavü-qədərin xeyrinə və şərinə inanmaq deməkdir".

Cəbrayıl bunun müqabilində: "Doğru dedin" de-mişdir.

(Qaynaqlar: Buxari, "Iman", 1/18, "Loğman" surəsi-nin təfsiri, 6/20/21; Müslim, "Iman", 1/39-40. Hər ikisi Əbu Hüreyrəyə istinad edir. Hədisi həmçinin Müslim "Iman"da (1/36-37) Ömərə istinadən verir, hədisin mətni yuxarıdakı kimidir).

## IMANIN ARTMASINA DƏLILLƏR

Allah-təala buyurur:

"O kəslər ki, xalq onlara: "Camaat (Əbu Süfyan və tərəfdarları) sizə qarşı qüvvə toplamışdır, on-lardan qorxun!" - dedikdə bu söz onların imanını daha da artırdı və onlar: "Allah bizə bəs edər. O nə gözəl vəkildir!" - deyə cavab verdilər" (Ali-Imran: 173).

"Möminlər yalnız o kəslərdir ki, Allah adı çə-kiləndə (Onun heybət və əzəmətindən) ürəkləri qor-xudan titrəyər. Allahın ayələri oxunduğu zaman hə-min ayələr onların imanlarını daha da artırır, onlar yalnız öz Rəbbinə təvəkkül edər" (əl-Ənfal: 2).

"Bir surə nazil edildiyi zaman münafiqlərdən: "Bu sizin hansınızın imanını artırdı?" - deyən-lər də var. Möminlərə gəlincə, (hər bir surə) on-ların imanını artırar və onlar (bu surələrin na-zil olmasına) sevinərlər" (ət-Tövbə: 124).

"Möminlər (müttəfiqlərin) ordu hissələrini gördükdə dedilər: "Bu, Allahın və Peyğəmbərinin bizə olan zəfər vədidir. Allah və Peyğəmbəri düz buyurmuşlar!" Bu (vəziyyət) onların yalnız (Allaha) imanını və itaətini artırdı" (əl-Əhzab: 22).

"Möminlərin imanını imanla artırmaq üçün on-ların ürəklərinə Öz dərgahından arxayınlıq (xa-tircəmlik) göndərən Odur. Göylərdəki və yerdəki bütün ordular Allahın ixtiyarındadır. Allah hər şeyi biləndir, Hikmət sahibidir!" (əl-Fəth: 4).

"Biz Cəhənnəm gözətçilərini yalnız mələklərdən etdik. Biz onların sayını ancaq kafirlərin imta-hana çəkilməsi, kitab verilənlərin yəqinlik hasil etməsi, iman gətirənlərin imanının daha da art-ması, kitab əhlinin və möminlərin şübhəyə düş-məməsi və həmçinin ürəklərində mərəz olanların "Allah bu məsəllə nə demək istəyir?" deməməsi üçün etdik. Allah istədiyi adamı haqq yoldan belə az-dırar və istədiyini də doğru yola yönəldər. Rəbbin ordularını Onun Özündən başqa heç kəs tanımır. Bu, insanlar üçün bir öyüd-nəsihətdir" (əl-Muddəs-sir: 31).

## IMANIN NAQISLIYINƏ DƏLILLƏR

1. Əbu Hüreyrənin (Allah ondan razı olsun!) rə-vayətinə görə, Peyğəmbər (s.ə.a.s) demişdir: “Ima-nın yetmişdən artıq şöbəsi vardır. Bunların ən yaxşısı “La ilahə illəllah”, ən aşağısı yol üstün-dən əzab-əziyyəti yox etməkdir. Həya da imanın bir şöbəsidir” (Qaynaqlar: Buxari, “Iman”, 1/8; Müslim “Iman”, 12-ci fəsil, 1/63. Mətn onundur).

2. Əbu Səid Xudri (Allah ondan razı olsun!) de-mişdir: “Mən Peyğəmbərin (s.ə.a.s) bu sözləri de-diyini eşitmişəm: “Sizdən kimsə inkar edilən bir şey görəndə onu əli ilə dəyişməli, edə bilməsə, dili ilə, bunu da bacarmasa, qəlbi ilə etməlidir. Bu ən zəif imandır” (Qaynaq: Müslim, “Iman”, 20-ci fəsil, 1/69).

## EHSAN BIR DAYAQDIR

Bil ki, Cəbrayıl Peyğəmbərdən (s.ə.a.s) ehsan ba-rədə soruşduqda demişdir: “Ibadətdə elə bil ki, sən Onu görürsən. Sən onu görməsən də, O səni gö-rür” (Qaynaqlar: Buxari, “Iman”, 1/18, “Loğman” surə-sinin təfsiri, 6/20-21; Müslim, “Iman”, 1/39-40. Hər iki mənbə Əbu Hüreyrəyə istinad edir. Bu hədi-si Müslim həmçinin “Iman” əsərində Ömərə isti-nadən verir: 1/36-37).

## DININ ÜÇ MƏRTƏBƏSI

Bunlar - Islam, Iman və Ehsandır. Bu tərtibi Müslim “Iman”da (1/36-37) Ömərə istinadən verir.

## TÖVHIDIN TƏRIFI

Müsəlman qardaş, bil ki, Allah məni və səni bunu bilməyə müvəffəq etmişdir ki, tövhidin aşağıdakı iki dayağı vardır.

BIRINCISI: Allahın ibadətlə fərdiləşdirilməsi.

Allah təala buyurur:

“Əlif, Lam, Ra! Bu, ayələri hikmət sahibi və hər şeydən agah olan (Allah) tərəfindən təsbit olun-muş və sonra da müfəssəl izah edilmiş bir kitab-dır ki, Siz Allahdan qeyrisinə ibadət etməyəsiniz. Mən sizi Allah tərəfindən (Cəhənnəmlə) qorxudan və (Cənnətlə) müjdələyənəm” (Hud: 1-2).

“Biz Nuhu öz tayfasına Peyğəmbər göndərdik. Nuh dedi: “Mən sizi (Axirət əzabından) açıq-aydın şə-kildə çəkindirirəm ki, Allahdan başqasına ibadət etməyəsiniz. Mən Qiyamət günündə sizə üz verəcək əzaba görə qorxuram” (Hud: 25-26).

“(Ya Məhəmməd!) Ad (tayfasının) qardaşı (Hudu) xatırla! O, qumsal təpələrdə sakin olan tayfasına - ondan qabaq da, sonra da peyğəmbərlər gəlib get-mişlər - belə demişdi: “Allahdan başqasına iba-dət etməyin. Mən böyük günün (Qiyamət gününün) sizə verəcəyi əzabdan qorxuram” (əl-Əhqaf: 21).

IKINCISI: Peyğəmbərin (s.ə.a.s) itaətlə fərdiləşdirilməsi. Biz yalnız Allaha ibadət etdiyimiz kimi Allahın peyğəmbərindən (s.ə.a.s) başqasına tabe olmamalı, itaət etməməli, ondan başqasının ardınca getməməliyik.

Allah-təala buyurur:

“(Ya Məhəmməd!) De ki: “Əgər siz Allahı sevir-sinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin və günahlarınızı bağışlasın. Allah ba-ğışlayan və mərhəmətlidir” (Ali-Imran: 31).

“...Peyğəmbər sizə nə verirsə, onu götürün, nəyi qadağan edirsə, ondan əl çəkin. Allahdan qorxun, həqiqətən, Allahın cəzası çox şiddətlidir” (əl-Həşr: 7).

“Amma xeyr! (Ya Məhəmməd!) Sənin Rəbbinə and olsun ki, onlar öz aralarında baş verən ixti-laflarda səni hakim təyin etməyincə və verdiyin hökmlərə görə özlərində bir sıxıntı duymadan sə-nə tam bir itaətlə boyun əyməyincə (həqiqi surətdə) iman gətirmiş olmazlar” (ən-Nisa: 65).

## TÖVHIDƏ DƏLILLƏR

Allah-təala buyurur:

“Quranı anlamasınlar deyə, onların qəlblərinə pərdə çəkib qulaqlarına əngəl qoyduq (kar etdik). Sən Quranda Rəbbini tək bir tanrı olaraq andığın zaman onlar nifrət əlaməti olaraq arxalarını çe-virib gedərlər” (əl-Isra: 46).

“Yalnız Allah zikr edildiyi zaman Axirətə inan-mayanların ürəklərini nifrət hissi bürüyür. Allah-dan qeyriləri yad edildikdə isə onları dərhal se-vinc bürüyür” (əz-Zümər: 45).

“Bu ona görədir ki, (dünyada) yalnız Allah çağı-rıldığı zaman siz (bunu) inkar etdiniz. Ona şərik qoşulduqda isə siz buna inandınız. Hökm isə Uca və Böyük Allahın əlindədir” (Qafir: 12).

Hədislər:

1. Ibn Abbasdan (Allah ondan və atasından razı olsun!) rəvayət olunur ki, “Peyğəmbər (s.ə.a.s) Müazı Yəmənə göndərərkən ona tapşırdı ki, Kitab əhli olan bir tayfa ilə rastlaşdıqda hər şeydən əvvəl onları Allah-təalanın tövhidini qəbul etməyə ça-ğırmalıdır” (Qaynaqlar: Buxari, “Tövhid” 8/164. Mətn bu qaynaqdan götürülmüşdür. Müslim, “Iman”, 1/50-51).

2. Tariq ibn Üşeym (Allah ondan razı olsun!) de-mişdir: “Peyğəmbərin (s.ə.a.s) bu sözləri dediyini eşitmişəm: “Allahın tövhidini iqrar edib Ondan qeyrisinə ibadəti rədd edənin malını zəbt etmək və qanını tökmək haramdır, onun haqq-hesabı Qüd-rət və Cəlal sahibi Allahın əlindədir” (Qaynaqlar: Müslim, “Iman”, 1/53. Əhməd, 3/472).

3. Ibn Ömər (Allah ondan və atasından razı ol-sun!) Peyğəmbərə (s.ə.a.s) istinadən bu hədisi ve-rir: “Islam beş (dayaq) üzərində qurulmuşdur: “Al-lahın tövhidi (təkliyinin iqrar edilməsi - Z.Q.), namaz qılmaq, zəkat vermək, Ramazan orucu və Həcc ziyarəti” (Qaynaq: Müslim, “Iman”, 1/45).

Mən deyərdim: “Bu dəlillərdə tövhidi inkar edənlərə tutarlı cavab vardır”.

## TÖVHIDIN DÖRD NÖVÜ

Müsəlman qardaş, bil ki, Allah mənə və sənə be-lə bir həqiqəti sübut etmişdir ki, tövhid dörd hissəyə bölünür. Bunlar aşağıdakılardır:

1. Rübubiyyət tövhidi;
2. Üluhiyyət tövhidi;
3. Adların və sifətlərin tövhidi;
4. Itaətdə tövhid.

Bu dörd növün hamısı mübarək “Fatihə” surə-sində verilir:

Sübhanəhu-təala buyurur:

“Bismillahir-rəhmanir-rəhim” - Rəhmli və mər-həmətli Allahın adı ilə! (əl-Fatihə: 1).

Bu ayədə adların və sifətlərin tövhidi ifadə edilir.

“Əl-həmdü lillahi rəbbil-aləmin - Aləmlərin Rəbbi Allaha şükr və tərif olsun” (əl-Fatihə: 2).

Bu ayədə Rübubiyyət tövhidi ifadə edilir.

“ər-Rəhmanir-rəhim. Maliki yaumid-din - Rəhmli və mərhəmətli olan Qiyamət gününün sahibinə!” (əl-Fatihə: 3-4).

Burada da adların və sifətlərin tövhidi ifadə edilir.

“Iyyakə nəbudu və iyyakə nəstəin - Yalnız Sənə ibadət edir, yalnız Səndən kömək diləyirik” (əl-Fatihə: 5).

Burada da Üluhiyyət tövhidi ifadə edilir.

“Ihdinas-siratəl-müstəqim. Siratəl-ləzinə ən-əmtə əleyhim ğeyril-məğzubi əleyhim və lazzalin - Bizə doğru yol, nemətlər bəxş etdiyin, qəzəbinə dü-çar olmayan kəslərin yolunu göstər”(əl-Fatihə: 6-7).

Bu ayələrdə itaətdə tövhid ifadə olunur. Bu ba-rədə bax: “Şərhul-əqidət-təhaviyə” (“Təhavi əqidə-sinin şərhi”, səh.89) və “əl-Camiul-fərid” (“Mi-silsiz toplu”, səh.276).

## RÜBUBIYYƏT TÖVHIDI

Rübubiyyət tövhidi Allahı Onun əməllərində və işlərində vahidləşdirmək (fərdiləşdirmək) de-məkdir. Bunun mənası odur ki, Allah-təala yarat-maqda, buyuruq verməkdə, bütün varlıqları heçdən vücuda gətirməkdə təkdir. Ona bu işdə nə bir şə-rik olan, nə də bir kömək edən vardır.

Allah-təala buyurur:

“Aləmlərin Rəbbi olan Allaha şükür və tərif olsun!”

Bu ifadə Qurani-kərimin altı yerində işlənir:

1. əl-Fatihə: 2-ci ayə;
2. əl-Ənam: 45-ci ayə;
3. Yunus: 10-cu ayə;
4. əs-Səffat: 182-ci ayə;
5. əz-Zümər: 75-ci ayə;
6. Ğafir (əl-Mümin): 65-ci ayə.

Allah-təala buyurur:

"Həqiqətən, Rəbbiniz göyləri və yeri altı gündə xəlq edən, sonra Ərşə yüksələn, gündüzün işığını ondan ayrılmaq istəməyən gecənin zülməti ilə ör-tən, günəşi, ayı və ulduzları yaradıb öz iradəsinə tabe edərək hərəkət etdirən Allahdır. Bilin ki, ya-ratmaq da, əmr etmək də Ona aiddir. Aləmlərin Rəbbi olan Allahın xeyir-bərəkəti saysız-hesabsız və sonsuzdur" (əl-Əraf: 54).

## ÜLUHIYYƏT TÖVHIDI

Üluhiyyət tövhidi Allahı ibadətdə vahid, tək bilməkdir. Yəni ibadətin qurban, nəzir, dua, tə-vəkkül, qorxu, rica, vəkalət, rəğbət, ehtiyat etmək, çəkinmək və başqa bu kimi bütün növlərini yalnız vahid və şəriksiz Allaha aid etməkdir.

Allah-təalanın buyruqları:

"Allaha ibadət edin və Ona heç nəyi şərik qoş-mayın! Valideynlərlə, qohumlarla, yetimlərlə, yox-sullarla, yaxın və uzaq qonşularla, yoldaş və dost-larla, yolçularla, sahib olduğun qul və kənizlərlə yaxşılıqla davran. Allah təkəbbürlü və özünü tə-rifləyən adamları xoşlamır!" (ən-Nisa: 36).

"Rəbbin yalnız Ona ibadət etməyi və vali-deynlərlə yaxşı davranmağı buyurmuşdur. Əgər on-lardan biri və ya hər ikisi sənin yanında yaşayıb qocalığın ən düşgün çağına yetərsə, onlara "uf" be-lə demə, üstlərinə qışqırma, acı söz söyləmə. On-larla xoş danış" (əl-Isra və ya Bəni-Israil: 23).

"Mən cinləri və insanları yalnız Mənə ibadət etmək üçün yaratdım" (əz-Zariyat: 56).

"Əşhədu ən la ilahə illəllah" - "Şəhadət veri-rəm ki, Allahdan başqa (ibadət haqqına malik) tan-rı yoxdur" ifadəsinin mənası da budur.

## ADLARIN VƏ SIFƏTLƏRIN TÖVHIDI

Adların və sifətlərin tövhidi Rəbbimizi yal-nız Onun Özünə və ya Peyğəmbərin (s.ə.a.s) Ona ver-diyi adlarla çağırmaq deməkdir. Onu yalnız Özünün və ya Peyğəmbərin (s.ə.a.s) Onu vəsf etdiyi sifət-lərlə vəsf etmək deməkdir.

Həm də bu halda nə uyğunlaşdırmaya, nə bənzətməyə, nə təhrifə, nə də nöqsana yol vermək olar.

Allah-təala buyurur:

"Göyləri və yeri yoxdan yaradan Allah sizin üçün özünüzdən zövcələr, heyvanlardan da cütlər (erkək və dişi) yaratmışdır. O sizi bu yolla çoxaldır. O, (hər şeyi) eşidən və görəndir!" (əş-Şura: 11).

Deməli, bizim Ona şamil etdiyimiz hər bir ad və sifət Qurani-kərim və Sünnədə mövcud olmalı və Onun əzəmətinə layiq olmalıdır.

Biz inanırıq ki, O eşidir, görür, istədiyi vaxt və istədiyi ilə danışır. O Öz Ərşinə Özünə layiq bir şəkildə yüksəlmişdir.

Allah-təala buyurur:

"Rəhman Ərşə yüksəldi" (Tahə: 5).

## ITAƏTDƏ TÖVHID

Itaətdə tövhid (və ya itaətin tövhidi - Z.Q.) Pey-ğəmbərin (s.ə.a.s) itaətdə fərdiləşdirilməsi, yə-ni yalnız ona itaət etmək, yalnız onun qoyduğu yolla getmək, tam sədaqətlə yalnız onun ardınca getmək deməkdir.

Allah-təalanın buyuruqları:

"(Ya Məhəmməd!) De ki: "Əgər siz Allahı sevir-sinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin və günahlarınızı bağışlasın. Allah ba-ğışlayan və mərhəmətlidir.

Söylə ki, Allaha və Onun Peyğəmbərinə itaət edin! Əgər üz döndərsəniz, şübhəsiz ki, Allah da kafirləri sevməz!" (Ali-Imran: 31-32).

“...Peyğəmbər sizə nə verirsə, onu götürün, nəyi qadağan edirsə, ondan əl çəkin. Allahdan qorxun. Həqiqətən, Allahın cəzası çox şiddətlidir” (əl-Həşr: 7).

“Hər kəs ona doğru yol aşkar olandan sonra Pey-ğəmbərə qarşı itaətsizlik edib, möminlərin yo-lundan fərqli bir yola uyarsa, onu istədiyinə qo-vuşdurar (kafirlər və münafiqlərə qovuşdurar) və Cəhənnəm odunu ona dadızdırarıq. Bu necə də acı bir taledir!” (ən-Nisa: 115).

Bu, “Əşhədü ənnə Mühəmmədən rəsulullah” - “Şə-hadət verirəm ki, Məhəmməd Allahın Peyğəmbəri-dir” şəhadətinin mənasını ifadə edir.

“Təhavi əqidəsi”nin şərhçisi demişdir (səh. 217): “Peyğəmbərə (s.ə.a.s) tamamilə təslim olmaq, Onun əmrinə tabe olmaq, onun barəsində deyilən-ləri qəbul və təsdiq etmək, batil xəyala qapılıb bu xəbəri ağlabatan adlandırmaqla ona qarşı çıxma-maq, ona şəkk gətirməmək, adamların fikirlərini, beyinlərinin zibillərini ondan üstün tutmamaq bi-zə vacibdir. Biz yalnız onun hökmünü qəbul etməli, yalnız ona təslim olmalı, tabe olmalı və itaət et-məliyik, necə ki, yalnız onu göndərənə ibadət və itaət, yalnız Ona təvəkkül edir və pənah aparırıq.

Bunlar bəndəni Allahın əzabından xilas edən iki tövhiddir: göndərənin tövhidi və göndərilmi-şin - Peyğəmbərin tövhidi.

Biz ondan qeyrisinə hökm üçün müraciət etmirik, ondan başqasının hökmünü qəbul etmirik, biz nə onun əmrini yerinə yetirmək işini dayandırır, nə də ki, onun barəsində bizə xəbər çatdıran şeyxin, imamın, məzhəb sahibinin, tayfa başçısının və ya ona təzim edənin dediyini əsas tutub onun hədi-sinə inamımızdan əl çəkirik. Ona yaxınlıq edən-lər onun əmrini yerinə yetirir və hədisini qəbul edirlər. Çünki doğrunu bilmək üçün müraciət edil-mək hüququnu onlara vermişdir. Onun əmrinə itaət-dən qaçan və hədisini qəbul etməyən onu təhrif edir, mənasını dəyişdirir. Bu təhrifə təvil (şərh) və həml (yük qoymaq, boynuna qoymaq, şamil et-mək mənasındadır - Z.Q.) adı verilmişdir. Deyi-lir: “Onu şərh edirik və ona şamil edirik. Bəndə-nin öz Rəbbi ilə şirkdən başqa hər hansı bir gü-nahla görüşməsi bu cür təvil və həmllə görüş-məkdən qat-qat yaxşıdır. Bəndə səhih hədis eşit-dikdə onu Peyğəmbərdən (s.ə.a.s) eşitdiyini hesab etməlidir. Məgər bu hədisin qəbulunu onu fi-lankəsin fikri və ya onun məzhəbinin ideyası ilə müqayisə edənə qədər gecikdirmək olarmı?! Bu hal-da ona heç bir tərəddüdə yol vermədən itaət etmək vacibdir. Peyğəmbər kəlamının filankəsin rəyinə müxalif olması ona şübhə etmək üçün əsas olmama-lıdır, əksinə, bu rəylərin özünə şübhə ilə yanaş-maq lazımdır, yaxud məntiqi müqayisəyə əsaslanıb hədisə qarşı çıxmaq olmaz, əksinə, bu müqayisələri mənasız hesab etməliyik. Hədis mətnlərini qəbul etməli, həqiqi kəlamı təhrif etməməliyik, xəyal-pərvərlərə uyub ağlabatan adlandırmamalıyıq. Bə-li, bu mətn məchuldur, naməlumdur, mücərrəddir! Lakin bu heç də hədisin filankəsin rəyinin əksinə olaraq qəbul edilməsi demək deyildir. Bu filankəs istər sağ olsun, istərsə də ölü olsun!”

## SÜNNƏNIN DÖRD NÖVÜ

1. Kəlam sünnəsi;
2. Əməl sünnəsi;
3. Iqrar sünnəsi;
4. Inkar sünnəsi.

1. Kəlam sünnəsinə Peyğəmbərin (s.ə.a.s) dedik-ləri daxildir. Biz də onu deməliyik.
2. Əməl sünnəsi - onun etdiyi əməllərdir. Biz də onları etməliyik.
3. Iqrar sünnəsi - onun iqrar etdikləridir. Biz də onları iqrar etməliyik.
4. Inkar sünnəsi - onun inkar etdikləri, rədd et-dikləridir. Biz də onları inkar və rədd etməliyik.

Allah-təala buyurur:

“(Ya Məhəmməd!) De ki: “Əgər siz Allahı sevir-sinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin və günahlarınızı bağışlasın. Allah ba-ğışlayan və mərhəmətlidir.

Söylə ki, Allaha və Onun Peyğəmbərinə itaət edin. Əgər üz döndərsəniz, şübhəsiz ki, Allah da kafirləri sevməz!” (Ali-Imran: 31-32).

“Həqiqətən, Allahın Peyğəmbəri Allaha, Qiyamət gününə ümid bəsləyənlər və Allahı çox zikr edənlər üçün gözəl nümunədir!” (əl-Əhzab: 21).

“...Peyğəmbər sizə nə verirsə, onu götürün; nəyi qadağan edirsə, ondan əl çəkin. Allahdan qorxun, həqiqətən, Allahın cəzası çox şiddətlidir” (əl-Həşr: 7).

## IBADƏTIN TƏRIFI

Ibadət ümumi bir ad olub Allahın sevdiyi və razı qaldığı bütün zahiri və daxili sözləri və əməlləri əhatə edir.

## IBADƏTIN BEŞ NÖVÜ

1. ETIQADLA IBADƏT: Bu, müsəlmanın Allahın xaliq (yaradan), raziq (ruzi verən), ölüləri diril-dən, öldürən və bəndələrin bütün işlərini idarə edən olmasına, yalnız Allahın dua, qurban və sai-rəyə şəriksiz layiq olmasına, əzəmət, kamillik, ül-vilik, cəlalət və bu kimi sifətlərlə vəsf edil-məsinə inanması deməkdir.

2. SÖZLƏ IBADƏT: Buraya "La ilahə illəllah və Mühəmməd rəsulullah" şəhadətini demək, Quran və dua oxumaq, Peyğəmbəri zikr etmək və bu kimi sözlə ifadə edilən ibadət növləri daxildir.

3. BƏDƏNLƏ IBADƏT: Bu növə namazda qiyam, rü-ku, səcdə, oruc tutmaq, həcc, hicrət və cihad əməl-ləri və bədənin iştirakı ilə həyata keçirilən başqa ibadətlər aiddir.

4. MALIYYƏ IBADƏTI: Zəkat, sədəqə vermək və bu kimi əməllər.

5. INKARLA IBADƏT: Bu, müsəlmanın bütün ha-ram, şirk və bidət olanları inkar edib Allahın şəriətinə tabe olması deməkdir. Bu müsəlmanın inkarla ibadətidir. Müsəlmanın Allahın mübarək camalı xatirinə haram işlərdən əl çəkməsi, onun əcrini daha da artırması deməkdir.

## HƏR HANSI BIR ƏMƏL YALNIZ BU IKI ŞƏRTLƏ QƏBUL EDILIR

Müsəlman qardaşım, bil ki, Allah-təala məni və səni Kitab və Sünnəyə əməl etməyə yönəltmişdir. Allah-təala heç kəsdən heç bir əməli aşağıda gös-tərilən iki şərtə əməl etmədən qəbul etməz. Bu şərtlər aşağıdakılardır:

BIRINCISI: Bu əməl yalnız Allaha tam səmimiyyətlə və sədaqətlə icra edilməlidir. Bu əməlin sahibi onunla yalnız Allah-təalanın mübarək sifətini nəzərdə tutmalıdır.

Allah-təala buyurur:

"(Ya Peyğəmbər!) Biz Kitabı sənə haqq olaraq na-zil etdik. Buna görə də son dini məhz Allaha aid edərək yalnız Ona ibadət et!

Bil ki, xalis din ancaq Allaha məxsusdur. Allahı qoyub (bütləri) özlərinə dost tutanlar: "Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!" - deyirlər. Şübhəsiz ki, Allah ixtilafda olduqları məsələlər barəsində (Qiyamət günü) on-ların arasında hökm edəcəkdir. Allah yalançı, nan-kor olan kimsəni doğru yola müvəffəq etməz!" (əz-Zümər: 2-3).

"De ki: "Mən Allaha dinimi yalnız ona məxsus edərək ibadət edirəm!" (əz-Zümər: 14)

Bu, "Əşhədü ən la ilahə illəllah" - "Şəhadət ve-rirəm ki, Allahdan başqa (ibadət haqqı olan) tanrı yoxdur" şəhadətinin mənasıdır.

IKINCISI: Hər hansı bir əməl Rəsulullahın (s.ə.a.s) göstərdiyi doğru yola müvafiq olmalıdır.

Aişədən (Allah ondan razı olsun!) rəvayət olunur ki, Peyğəmbər (s.ə.a.s) demişdir: "Bizim işimizdə (Islam dinində - Z.Q.) ona uyğun gəlməyən bir əməl qəbul edilməzdir" (Qaynaqlar: Buxari, "əs-Sülh", 3/167; Müslim, "əl-Əqziya" (Qəzalar), 3/1343. Müslimin rəvayətində (3/1344) hədis belə səslənir: "Bizim əmrimizin aid olmadığı əməl qəbul edilməzdir").

Bu, "Əşhədü ənnə Mühəmmədən rəsulullah" - "Şə-hadət verirəm ki, Məhəmməd Allahın rəsuludur" ifadəsinin mənasıdır.

## ISLAM DININ XÜLASƏSI

Müsəlman qardaş, bil ki, Allah-təala məni və səni sevdiyi və razı qaldığı bir şeyə müvəffəq et-mişdir.

Islam dini iki əzəmətli, əsas, mühüm qaydaya əsaslanır.

BIRINCISI: Vahid və şəriksiz olan Allahdan başqa heç kəsə ibadət etmirik.

Allah-təala buyurur:

“Rəbbin yalnız Ona ibadət etməyi və valideyn-lərlə yaxşı davranmağı buyurmuşdur. Əgər onlar-dan biri və ya hər ikisi sənin yanında yaşayıb qo-calığın ən düşgün çağına yetərsə, onlara “uf” belə demə, üstlərinə qışqırıb acı söz söyləmə. Onlarla xoş danış” (əl-Isra və ya Bəni-Israil: 23).

“(Ya Məhəmməd!) Söylə ki: “Ey kitab əhli, sizinlə bizim aramızda eyni olan “Allahdan başqasına ibadət etməyək. Ona şərik qoşmayaq və Allahdan başqasına ibadət etməyək. Ona şərik qoşmayaq və Allahı qoyub bir-birimizi özümüzə Rəbb qəbul et-məyək” sözlərinə gəlin. Əgər onlar yenə də üz dön-dərərlərsə, o zaman deyin: “Indi şahid olun ki, biz həqiqətən də müsəlmanıq!” (Ali-Imran: 64).

Bu, “Əşhədü ən la ilahə illəllah” şəhadətinin mənasıdır.

IKINCISI: Biz yalnız Allahın kitabında və Onun Peyğəmbərinin (s.ə.a.s) Sünnəsində verilən şəriətə inanmalıyıq. Imanımız həm bidətdən, həm də fantaziyadan (mistikadan) uzaq olmalıdır.

Allah-təala buyurur:

“Rəbbinizdən Sizə nazil olan Qurana tabe olun. Allahı qoyub başqa havadarlara uymayın. Siz öyüd-nəsihətlərə olduqca az qulaq asırsınız” (əl-Əraf: 3).

“...Peyğəmbər sizə nə verirsə, onu götürün; nəyi qadağan edirsə, ondan əl çəkin. Allahdan qorxun. Həqiqətən, Allahın cəzası çox şiddətlidir” (əl-Həşr: 7).

Bu, “Əşhədü ənnə Mühəmmədən rəsulullah” şəha-dəti deməkdir.

## NIFAQIN (DINDƏ KAFIRLIYIN) IKI NÖVÜ

Müsəlman qardaş, bil ki, Allah-təala məni və səni nifaq və pis əxlaqdan uzaq tutmuşdur. Nifa-qın iki növü vardır:

1. Etiqadda olan nifaq;
2. Əməldə olan nifaq.

Etiqadda olan nifaq ona yol verənin zahirən Is-lama bağlılığı nümayiş etdirməsi, əslində isə daxilən küfrlə bağlı olması deməkdir. Bu növ ni-faqa yol verən kəs zahirən müsəlman olsa da, əs-lində kafir və zındıqdır. Əgər bu halda da ölsə, Cəhənnəmin ən dərin qatında yerləşdiriləcəkdir.

Allah-təala buyurur:

“(Ya Məhəmməd!) Əlbəttə, münafiqlərin yeri Cə-hənnəmin ən dərin təbəqəsindədir. Sən heç vaxt on-lara yardım edən tapa bilməzsən! Yalnız tövbə edib saleh əməl sahibi olanlar, Allahla (qırıl-maz tellərlə) bağlı olanlar və öz dinini Allaha məxsus edənlər istisnadır. Onlar möminlərlə birlikdədirlər. Möminlərəsə Allah böyük əcr (mü-kafat) bəxş edəcəkdir!” (ən-Nisa: 145-146).

## ƏMƏLDƏ NIFAQIN IZAHI

Aşağıdakı hədislərdə göstərilən beş günah əməldə nifaqa yol verilir:

1. Əbu Hüreyrədən (Allah ondan razı olsun!) rəva-yət olunur ki, Peyğəmbər (s.ə.a.s) demişdir: “Müna-fiqin əməlləri üçdür:

- yalan danışmaq;
- vədə xilaf çıxmaq;
- əmanətə xəyanət etmək”.

(Qaynaqlar: Buxari, “Iman”, 1/14; Müslim, “Iman”, 1/78-79. Müslim bu ifadəni artırıb: “Yalnız na-maz qılıb və oruc tutmaqla müsəlman olduğunu id-dia etmək”).

2. Abdulla ibn Əmrin (Allah onlardan razı ol-sun!) rəvayəti: “Peyğəmbər (s.ə.a.s) demişdir: “Dörd xasiyyətə malik olan münafiqdir. Bu xasiyyətlərdən birinə malik olanın xislətində nifaq olur və hət-ta bunu iddia da edir:

- əmanətə xəyanət etmək;
- yalan danışmaq;
- vədə xilaf çıxmaq;
- rəqabəti biabırçılığa çevirmək”.

(Qaynaqlar: Buxari, “Iman”, 1/14. Mətn onundur. Müs-lim, “Iman”, 1/78).

Mən deyirəm: “Nifaqın bu növü ona yol verəni Is-lamdan xaric etmir. Lakin ona tövbə vacibdir”.

## ALLAHA ŞƏRIK QOŞMAQ TƏHLÜKƏSI

Allah-təala buyurur:

“Həqiqətən, Allah Ona şərik qoşanı bağışlamaz, bundan başqa istədiyi şəxsləri bağışlaya bilər. Allaha şərik qoşan şəxslər, şübhəsiz, ən ağır gü-nah işlətmiş olurlar” (ən-Nisa: 48).

“Allah, Ona şərik qoşanı əsla bağışlamaz. Bun-dan başqa olan günahları isə istədiyi şəxsə ba-ğışlar. Allaha şərik qoşan şəxs, şübhəsiz ki, (haqq yolundan) çox azmışdır!” (ən-Nisa: 116).

“Şübhəsiz ki, “Allah Məryəm oğlu Məsihdir!” de-yənlər kafir oldular. Halbuki Məsih (Isa) belə de-mişdir: “Ey Israil övladları! Mənim də, sizin də Rəbbimiz olan Allaha şərik qoşana Allah, şübhə-siz ki, Cənnəti haram edər. Onun düşəcəyi yer Cə-hənnəmdir. Zalimlərin heç bir köməkçisi yoxdur!” (əl-Maidə: 72).

“Allaha üz tutub Ona şərik qoşmayın! Allaha şə-rik qoşan göydən yerə düşüb quşların diddiyi, kü-ləklərin sovurub apardığı və (tikələrini) uzaq-lara atdığı (kəslər) kimidir!” (əl-Həcc: 31).

“(Ya Məhəmməd!) Bir zaman Loğman oğluna nəsi-hət verərək demişdir: “Oğlum! Allaha şərik qoş-ma! Həqiqətən, şirk ən böyük zülmdür!” (Loğman: 13).

“Bu, Allahın haqq yoludur, bəndələrinin istədi-yini ona yönəldər. Əgər onlar Allaha şərik qoşsay-dılar, əməlləri puça çıxardı” (əl-Ənam: 88).

“(Ya Məhəmməd!) Sənə və səndən əvvəlkilərə be-lə vəhy olunmuşdur: “Allaha şərik qoşsan, bütün əməlin puça çıxacaq və mütləq ziyan çəkənlərdən olacaqsan!

Xeyr, yalnız Allaha ibadət et və Ona  şükür edən-lərdən biri ol!” (əz-Zümər: 65-66).

“...Müşriklərdən olmayın!” (əl-Ənam: 14; Yunus: 105; əl-Qəsəs: 87).

“(Ya Məhəmməd!) Sən və ümmətin tövbə edərək Allaha tərəf dönün! Allahdan qorxun! Namaz qılın və müşriklərdən olmayın!” (ər-Rum: 31).

Hədislər:

Cabir ibn Abdulladan (Allah ondan razı olsun!) rəvayət olunur ki, Peyğəmbərin (s.ə.a.s) hüzuruna bir kişi gəlib dedi: “Ya Rəsulullah! Vacib olan iki şey hansılardır?” Peyğəmbər (s.ə.a.s) belə cavab verdi: “Allaha bir şeyi şərik qoşmadan ölən Cən-nətə daxil olar. Allaha şərik qoşaraq ölənsə Cə-hənnəmə daxil olar” (Qaynaq: Müslim, “Iman, 46-cı fəsil, 1/94).

2. Onun başqa bir rəvayətində deyilir ki, Peyğəm-bərin (s.ə.a.s) bu sözləri dediyini eşitmişdir: “Allahla Ona heç nəyi şərik qoşmadan görüşən şəxs Cənnətə daxil olar. Allahla Ona şərik qoşa-raq görüşənsə Cəhənnəmə daxil olar” (Qaynaq: Müs-lim, “Iman”, 46-cı fəsil, 1/94).

## ŞIRKIN NÖVLƏRI

Şirkin növləri çoxdur, onlardan yalnız 14-nü qeyd edək. Bunlar aşağıdakılardır:

1. RÜBUBIYYƏTDƏ ŞIRK:

Bu, bir şəxsin Allahdan başqa yaradan, ruzi ve-rən, dirildən, öldürən və bu kimi ilahi sifətlərə malik qüvvənin olmasına inanmasıdır.

2. ÜLUHIYYƏTDƏ ŞIRK:

Bu, bir şəxsin Allahdan başqa Allahın izni ol-madan zərər və ya xeyir verə bilən, yaxud şəfa verə bilən və bu kimi ilahi sifətlərə malik qüvvənin olmasına inanması deməkdir.

3. ADLARDA VƏ SIFƏTLƏRDƏ ŞIRK:

Bu, o deməkdir ki, kimsə məxluqlardan bəzilə-rini yalnız Allaha məxsus ola bilən, məsələn, qeybi bilmək və Rəbbimiz Sübhanəhu-təalanın bu kimi sifətləri ilə vəsf etmiş olsun.

4. ƏN BÖYÜK ŞIRK:

Bu, etiqadda olan şirkdir. Sahibini Islam üm-mətindən xaric etmiş olur.

5. KIÇIK ŞIRK:

Bu, riyakarlıqdır. Insanı Islam ümmətindən xa-ric etməsə də, tövbəni vacib bilir.

6. GIZLI ŞIRK:

Bu, adamın başqasının əvəzinə iş görməsidir; bu da riyakarlıqdır. Bildiyiniz kimi, bu, adamı Islamdan xaric etməsə də, tövbəni vacib edir.

7. ETIQADDA OLAN ŞIRK:

Bu, ən böyük şirkdir. Ona yol verəni Islam mil-lətindən xaric edir; bu halda ümid yalnız Allaha-dır.

8. ƏMƏLDƏ ŞIRK:

Bu, Islam şəriətinin barəsində şirk hökmü çı-xarmış olduğu Allahdan qeyrisinə qurban kəsmək, Allahdan qeyrisinə nəzir boyun olmaq və s. əməl-lərdir.

9. SÖZDƏ ŞIRK:

Islam şəriətinin barəsində şirk hökmü çıxar-mış olduğu Allahdan qeyrisinə and içmək, bəzilə-rinin işlətdiyi "Allahdan və səndən başqa pəna-hım yoxdur, Allaha və Sənə təvəkkül etdim, əgər Al-lah və filan olmasaydı" və i.a. bu kimi şirk ifadə edən sözlər bu növ şirkə aiddir.

10. QANUNVERICILIKLƏ ŞIRK:

Bu, o deməkdir ki, insan Qurani-kərim və Sünnə-ni qoyub ayrı-ayrı şəxslərin fikirlərini, bəşəri qanunları əsas götürsün.

Allah-təala bu barədə buyurur:

"Yoxsa müşriklərin Allahın dində izn vermə-diyi bir şeyi onlar üçün qanuni (halal) edən şərik-ləri vardır?! Əgər (Allahın) qəti sözü olmasaydı, (qiyamət) hökmü (elə dünyada da) icra edilərdi" (əş-Şura: 21).

11. MƏHƏBBƏTDƏ ŞIRK:

Bu, o deməkdir ki, Allahdan qeyrisini Allahı sevdiyi kimi və ya daha böyük məhəbbətlə sevmiş olsun.

Allah-təala buyurur:

"Insanların içərisində Allahdan qeyrilərini Allaha şərik qoşub, onları Allahı sevən kimi se-vənlər də vardır. Halbuki iman gətirənlərin Al-laha məhəbbəti daha da qüvvətlidir. Əgər özlərinə zülm edənlərin vaxtında görəcəkləri əzabdan xə-bərləri olsaydı, onlar bütün qüvvət və qüdrətin Al-laha məxsus olduğunu və Onun əzabının şiddətli olacağını bilərdilər" (əl-Bəqərə: 165).

12. XOF VƏ QORXUDA OLAN ŞIRK:

Bu barədə "Qorxunun dörd növü" fəslində danı-şacağıq.

13. MƏQSƏD VƏ ISTƏKDƏ OLAN ŞIRK:

Bu, insanın öz əməli ilə Allahdan qeyrisini istəməsi, Allahın mübarək camalından başqa bir məqsədə yönəlməsi deməkdir.

14. ITAƏTDƏ OLAN ŞIRK:

Bəndənin haramı halal, halalı isə haram et-məkdə hər hansı bir şəxsə itaət etməsi bu növ şirkə aiddir.

Bu barədə Allah-təala buyurur:

"Onlar Allahı qoyub alimlərini və rahiblərini, Məryəm oğlu Məsihi özlərinə tanrı etdilər. Hal-buki onlara yalnız bir olan Allaha ibadət etmək əmr olunmuşdur. Ondan başqa heç bir tanrı yoxdur. Allah müşriklərin Ona şərik qoşduqları bütlər-dən uzaqdır!" (ət-Tövbə: 31).

## QORXUNUN DÖRD NÖVÜ

1. IBADƏT OLAN QORXU

Bu, yalnız vahid və şəriksiz Allahdan qorxudur. Bu, qəlbən Allaha ibadətdir.

Allah-təala buyurur:

"Şübhəsiz ki, Rəbbinin hüzurunda haqq-hesabdan qorxanı iki Cənnət (Ədn və Nəim) gözləyir" (ər-Rəhman: 46).

"Amma kim (Qiyamət günü) Rəbbinin hüzurunda dur-maqdan qorxmuş və nəfsi-istəyinə şəhvəti qadağan etmişsə, həqiqətən, onun yeri Cənnətdir!" (əz-Zariyat: 40-41).

Allah-təala bəndələri olan mələkləri vəsf edə-rək buyurur:

"Onlar öz fövqündə olan Allahdan qorxar və öz-lərinə buyurulanları edərlər" (ən-Nəhl: 50).

"Allahın risalələrini təbliğ edənlər Ondan qorxar, Allahdan başqa heç kəsdən qorxmazlar. Al-lahın çəkdiyi haqq-hesab kifayətdir" (əl-Əhzab: 39).

2. ŞIRK OLAN QORXU

Bu, bəndənin cin, ölü və sairədən Allahdan qorx-duğu kimi və daha artıq qorxmasıdır.

Allah-təala buyurur:

“(Ya Məhəmməd!) O şəxsləri görmürsənmi ki, on-lara (vaxtı ilə) “müharibədən əl çəkin, namaz qı-lın, zəkat verin!” deyilmişdir. Onlara cihad etmək vacib olduqda isə, içərilərindən bir qismi Allah-dan qorxan kimi və ya daha artıq insanlardan qorxuya düşərək: “Ey Rəbbimiz! Cihad etməyi nə üçün bizə vacib etdin, nə olardı ki, bizi yaxın zamana qədər (öz əcəlimiz çatana qədər) yubandıraydın” dedilər. Onlara söylə ki, dünyanın ləzzəti və faydası azdır, lakin müttəqi üçün Axirət daha xeyirlidir. Sizə (müttəqilərə) xurma çəyirdəyindən olan nazik tel qə-dər belə zülm olmayacaqdır!” (ən-Nisa: 77).

3. ASILIK OLAN QORXU (GÜNAH OLAN QORXU)

Bu, bəndənin bir adamdan və ya bir qrup adamdan qorxaraq vacib olanı unutması, onlardan qorxaraq harama yol verməsi və bunun ikrah həddinə çatma-sıdır.

Allah-təala buyurur:

“Sizi yalnız o şeytan öz dostlarından (guya onla-rın çox qüvvətli) olması ilə qorxudub çəkindirir. Amma siz onlardan qorxmayın! Əgər mömінsinizsə, Məndən qorxun!” (Ali-Imran: 175).

“(Ya Məhəmməd!) Hara (səfərə) çıxsan, (namaz vaxtı) üzünü Kəbə məscidinə tərəf çevir! Harada olsanız, üzünüzü o tərəfə döndərin ki, özlərinə zülm edənlərdən başqaları sizə irad tutmasınlar. Siz onlardan deyil, Məndən qorxun ki, Mən də sizə olan nemətimi tamamlayım. Bəlkə, onda siz haqq yo-lunu tapasınız” (əl-Bəqərə: 150).

“...Onlardan qorxmayın, Məndən qorxun!..” (əl-Maidə: 3).

“...Insanlardan qorxmayın, Məndən qorxun!..” (əl-Maidə: 44).

4. TƏBII QORXU (ADI QORXU)

Bu, insanın düşməndən, vəhşi heyvandan, ilan-dan və sairədən qorxmasıdır. Bu, həddini aşma-yanda caizdir.

Allah-təala bəndəsi və peyğəmbəri Musanın (Ona salam olsun!) vəziyyətindən danışarkən buyurur:

“Belə ki, Musa (Qıbtlının öldürüldüyündən) qor-xaraq səhəri nigarançılıq içində qarşıladı. Bir də nə görsə, yaxşıdır! Dünən ondan imdad diləyən kəs bu gün fəryad çəkib yenə onu köməyə çağırır. Musa ona dedi: “Sən, doğrudan da, açıq-aşkar bir azğınsan!” (əl-Qəsəs: 18).

“Musa qorxu və intizar içində şəhərdən çıxıb “Pərvərdigara! Məni bu zalim tayfanın əlindən qurtar!” dedi” (əl-Qəsəs: 21).

“Qardaşım Harun danışıqda məndən bəlağətli-dir. Onun da, mənim də dediklərimi təsdiqləyərək bir köməkçi göndər. Onların məni yalançı hesab edəcəklərindən qorxuram” (əl-Qəsəs: 34).

“Musa dedi: Ey Rəbbim! Onların məni yalançı sa-yacaqlarından qorxuram!” (əş-Şüəra: 12).

“Musa həmçinin dedi: Ey Rəbbim, mən onlardan bir nəfəri öldürmüşəm, qorxuram ki, onlar da mə-ni öldürələr” (əl-Qəsəs: 33).

## MƏHƏBBƏTIN DÖRD NÖVÜ

1. IBADƏT OLAN MƏHƏBBƏT

Bu, Allaha və Allahın sevdiyinə olan məhəb-bətdir.

Allah-təala buyurur:

“Insanların arasında Allahdan qeyrilərini Al-laha şərik qoşub onları Allahı sevdikləri kimi sevənlər də vardır. Halbuki iman gətirənlərin Allaha məhəbbəti daha qüvvətlidir. Əgər özlərinə zülm edənlərin vaxtında görəcəkləri əzabdan xə-bərləri olsaydı, onlar bütün qüvvət və qüdrətin Allaha məxsus olduğunu və onun əzabının şiddətli olacağını bilərdilər” (əl-Bəqərə: 165).

2. ŞIRK OLAN MƏHƏBBƏT

Məhəbbətin bu növü bəndənin Allahdan qeyrisini Allahı sevdiyi kimi və ya daha böyük bir məhəbbətlə sevməsidir.

Allah-təala buyurur:

“Insanların arasında Allahdan qeyrilərini Al-laha şərik qoşub, onları Allahı sevdikləri kimi sevənlər də vardır” (əl-Bəqərə: 165).

3. ASILIK OLAN MƏHƏBBƏT (Günah olan məhəb-bət)

Haram və bidət olanlara, asi, bidətçi və yelbe-yin adamlara bəslənilən və bu kimi şəriətə müxa-lif məhəbbət bu növə daxildir.

4. TƏBII MƏHƏBBƏT

Adamın övladlarına, ailəsinə, özünə, mal-döv-lətinə və bu kimi icazə verilmiş şeylərə olan mə-həbbəti bu növə aiddir. Bu məhəbbət təbii olma-lıdır. Bu məhəbbət insanı Allaha itaətdən ayı-rarsa və bəzi vacib əməllərin unudulmasına gəti-rib çıxararsa, asilikdə məhəbbətə çevrilər. Əgər bu məhəbbət insanın qəlbində və həyatına üstün gəlsə və insan həyatı Allahı sevdiyi kimi və ya da-ha artıq bir məhəbbətlə sevsə, onda şirk məhəb-bətinə çevrilir.

## ALLAHDAN QEYRISINƏ DUANIN HARAM EDILMƏSI

Allah-təala buyurur:

"(Məkkə müşrikləri) Allahı qoyub yalnız qadın bütlərə dua edir və yalnız asi (inadkar) şeytana ibadət edirlər.

Allah şeytana lənət etdi. O isə dedi: "Əlbəttə, mən sənin bəndələrindən lazımi payı alacağam" (ən-Nisa: 117-118).

"De ki: "Biz Allahı qoyub bizə nə bir xeyir, nə də bir zərər verə bilən bütlərəmi dua edəcək və Al-lah bizi doğru yola yönəltdikdən sonra Yer üzündə şaşqın dolaşarkən şeytanların azdırdığı adam kimi geriyəmi (küfrə) döndəriləcəyik? Halbuki dostları ona: "Bizə tərəf gəl!" deyərək haqq yola ça-ğırırdılar. De ki: "Allahın hidayəti (Islam) doğru yoldur. Bizə aləmlərin Rəbbinə təslim olmaq əmr edilmişdir" (əl-Ənam: 71).

"Allahdan başqa dua etdikləriniz də sizin kimi bəndələrdir. Əgər bu aləmdə haqlısınızsa, onda onları çağırın, qoy sizə cavab versinlər" (əl-Əraf: 194).

"Sizin Allahdan başqa dua etdiklərinizsə nə sizə, nə də özgələrinə kömək edə bilər" (əl-Əraf: 197)

"Allahdan başqa sənə nə xeyir, nə də zərər verə bilənlərə dua etmə! Əgər bunu etmiş olsan, şüb-həsiz ki, özünə zülm edənlərdən olacaqsan!" (Yunus: 106).

"Haqq olan yalnız Allaha olan duadır. Ondan baş-qasına edilən dualar qəbul olunmaz. Müşriklərin vəziyyəti ağzına su almaq üçün iki ovcunu açan, lakin suyun yetişmədiyi adamın vəziyyətinə bənzəyir. Kafirlərin duası zəlalətdən (yol azmaqdan) başqa bir şey deyildir!" (ər-Rədd: 14).

"Dua edilən Allahdan qeyriləri heç bir şey yara-da bilmirlər, onlar özləri yaradılmışdır. Onlar ölüdür, diri deyillər, nə vaxt diriləcəklərini də bilməzlər" (ən-Nəhl: 21).

"Bunlar o deməkdir ki, Allah haqq, Ondan başqa dua edilənlərsə batildirlər. Həqiqətən, Allah (hər şeydən) uca və böyükdür" (Loğman: 30; əl-Həcc: 162).

"Ey insanlar! Çəkilən məsələ qulaq asın! Dua edi-lən Allahdan başqa qeyriləri hamılıqla toplaşsa-lar belə, bir milçək də yarada bilməzlər. Əgər milçək onlardan bir şey zəbt edib aparsa, onu geri ala bilməzlər. Istəyən də aciz, istənilən də!" (əl-Həcc: 73).

"Allahla yanaşı başqa bir tanrıya heç bir əsası olmaya-olmaya dua edənin haqq-hesabı Allahın əlin-dədir. O, kafirlərə nicat verməz" (əl-Muminun: 117).

"Elə isə, çəkin! Allahla yanaşı başqa bir tanrı-ya dua etmə, yoxsa əzaba düçar olarsan" (əş-Şüəra: 213).

"Allahla yanaşı başqa bir tanrıya dua etmə! Al-lahdan başqa heç bir tanrı yoxdur! Allahdan başqa hər şey məhkumdur! Hökm onundur! Siz məhz onun hü-zuruna qaytarılacaqsınız!" (əl-Qəsəs: 88).

"Allahdan qeyrisini özünə övliya seçənlər özünə yuva qurmuş hörümçək kimidirlər. Evlərin ən zəifi isə, şübhəsiz ki, hörümçək yuvasıdır! Kaş biləydi-lər! Şübhəsiz ki, Allah onların Allahı qoyub nəyə dua etdiklərini bilir. O, yenilməz qüvvət və hikmət sahibidir!" (əl-Ənkəbut: 41-42).

"Allah gecəni gündüzə, gündüzü də gecəyə qatar. O, günəşi və ayı da özünə tabe etmişdir. Onlardan hər biri öz dairəsində müəyyən vaxtadək dövr edər. Bu sizin Rəbbiniz olan Allahdır. Hökm Onundur. Sizin Ondan qeyri dua etdikləriniz bir çərdək qa-bığına belə sahib deyillər. Əgər siz onlara dua etsəniz, onlar sizin duanızı eşitməzlər, eşitsə-lər də, cavab verməzlər. Özləri də qiyamət günü si-zin şərik qoşduğunuzu danacaqlar. Heç kəs sənə (Peyğəmbərə) hər şeydən xəbərdar olan Allah kimi xəbər verə bilməz!" (Fatir: 13-14).

"Həqiqətən, əgər onlardan: "Göyləri və yeri kim yaratmışdır?!" - deyə soruşsan, mütləq: "Allah!" - deyə cavab verəcəklər. (Ya Məhəmməd!) De ki: "Elə isə bir söyləyin görək, əgər Allah mənə zərər ver-mək istəsə, sizin Allahdan qeyri dua etdikləriniz Onun zərərini aradan qaldıra bilərmi? Yaxud: "Əgər Allah mənə bir mərhəmət göstərsə, onlar Onun mərhəmətinə mane ola bilərmi?! De ki: "Mənə təkcə Allah kifayət edər. Təvəkkül edənlər yalnız Ona təvəkkül edərlər!" (əz-Zümər: 38).

"(Ya Məhəmməd!) Bu müşriklərə de ki: "Mənə bir xəbər verin, göstərin görüm, sizin Allahdan başqa dua və ibadət etdikləriniz yer üzündə nə yaratmış-lar?! Yoxsa onların göylərdə Allahla bir şərik-liyi var?! Əgər

doğru deyirsinizsə, mənə bu Quran-dan əvvəl (Allahdan nazil olmuş) bir kitab, yaxud elmdən bir nişanə gətirin!

Allahı qoyub qiyamətədək özünə cavab verə bilmə-yən bütlərə dua edən kimsədən daha çox haqq yolun-dan azmış kim ola bilər? Halbuki bu bütlər onla-rın dualarından xəbərsizdirlər!

Insanların məhşərə toplanacaqları zaman bu bütlər onlara düşmən olacaq və onların dualarını inkar edəcəklər" (əl-Əhqaf: 4-6).

"Şübhəsiz ki, bütün məscidlər Allaha məxsusdur. Allahla yanaşı başqa birisinə dua etməyin!" (əl-Cinn: 18).

"(Ya Məhəmməd!) De ki: "Mən Rəbbimə dua edərək Ona heç nəyi şərik qoşmaram". De ki: "Mən sizə nə zərər, nə də xeyir verə bilərəm!" (əl-Cinn: 20-21).

Bu məzmunda ayələrin sayı çoxdur.

Hədislər:

1. Nüman ibn Bəşirdən (Allah ondan və atasın-dan razı olsun!) rəvayət olunur ki, Rəsulullah (s.ə.a.s) dedi: "Dua ibadətdir" və sonra bu ayəni oxudu: "Rəbbimiz buyurdu: "Mənə dua edin ki, mən də sizə cavab verim. Mənə ibadət etməyi təkəbbürünə sığışdırmayanlar Cəhənnəmə zəlil olaraq girə-cəklər" (Qafir və ya əl-Mümin: 60). (Qaynaqlar: Əbu Davud, "əs-Səlat", 2/76-77; Tirmizi, üç yerdə:

1. "əl-Bəqərə" surəsinin təfsiri, 5/211;
2. "Qafir" surəsinin təfsiri, 5/374-375;
3. "Dualar", 5/456.

Ibn Macə, "Dua", 2/1258. Səhih istinadlı hədis-dir).

2. Abdulla ibn Abbasdan (Allah ondan və atasın-dan razı olsun!) rəvayət olunur ki, o, Peyğəmbərin (s.ə.a.s) tərkinə mindiyi vaxt Peyğəmbər (s.ə.a.s) de-yir: "Ey cavan oğlan! Mən sənə bu sözləri öyrədirəm. Allahı yadda saxla ki, səni qorusun. Allahı yadda saxla ki, onun yanında qalasan. Bir şey soruşsan, yalnız Allahdan soruş, kömək diləsən, yalnız Al-lahdan dilə; bil ki, əgər bütün millət sənə bir xe-yir vermək üçün bir yerə toplaşsa, sənə Allahın ya-zısından artıq bir şey verə bilməz. Bil ki, əgər ümmət sənə zərər vermək üçün bir yerə toplaşsa, Allahın yazısından artıq bir şey edə bilməz. Qə-ləmlər artıq qaldırılmışdır, mürəkkəb qurumuş-dur" (Qaynaq: Tirmizi, "Qiyamətin əlaməti", 59-cu fəsil, 4/667; Əhməd, 1/293. Səhih istinadlı hə-disdir.)

## NƏZIR DƏ IBADƏTDIR, ALLAHDAN QEYRISINƏ IBADƏT OLMUR

Allah-təala buyurur:

"(Allah yolunda) xərclədiyiniz və nəzir etdiyiniz hər hansı şeyi, şübhəsiz ki, Allah bilir, lakin (xəsislik göstərib) özlərinə zülm edənlərin (Qiya-mət günü) heç bir köməyi olmaz!" (əl-Bəqərə: 270).

"(Ya Məhəmməd!) Imranın zövcəsinin: "Ey Rəb-bim, bətnimdəkini sənə xidmətçi olmaq üçün nəzir edirəm. Bu nəziri məndən qəbul et! Əlbəttə, Sən eşidən və bilənsən!" - dediyini xatırla!" (Ali-Imran: 35).

"Sonra həcc əməllərini yerinə yetirsinlər, nə-zirlərini versinlər və qədim evin (Kəbənin) ba-şına dolansınlar!" (əl-Həcc: 29).

"Onlar (Allahdan qorxanlar) elə kimsələrdir ki, verdikləri nəziri yerinə yetirər və dəhşətli gün-dən (Qiyamət günündən) qorxarlar" (Insan və ya əd-Dəhr: 7).

"Müşriklər Allah üçün Onun yaratdığı əkinlər-dən və davardan pay ayırıb öz batil imanlarına gö-rə: "Bu, Allahın və bu da Allaha şərik qoşduğumuz bütlərin!" dedilər. Onların bütləri üçün ayrılmış hissə Allaha çatmaz, Allah üçün ayrılmış hissə isə bütlərə çatardı. Onların verdikləri hökm necə də pisdir!" (əl-Ənam: 136).

"Müşriklər onlara verdiyimiz ruzidən heç bir şey bilməyən, anlamayan bütlərə pay ayırırlar. Al-laha and olsun ki, yaxdığınız iftiralara görə sor-ğu-sual ediləcəksiniz!" (ən-Nəhl: 56).

Hədis:

Aişədən (Allah ondan razı olsun!) rəvayət olunur ki, Peyğəmbər (s.ə.a.s) demişdir: "Allaha itaət üçün nəzir verən Ona itaət etmiş olur. Ona asilik üçün nəzir verənsə Ona asi olur" (Qaynaqlar: Buxari, "Iman" və "Nəzir", 7/233-234).

Mən deyirəm: “Allahdan qeyrisinə verilən nəzir asilikdir, onu vermək olmaz!”. “Asilik üçün verilən nəzir qəbul olunmaz” (hədis).

## ALLAHDAN QEYRISINƏ QURBAN KƏSMƏYIN HARAM EDILMƏSI

Allah-təala buyurur:
“(Ya Məhəmməd!) De ki: “Mənim namazım da, həya-tım da, ölümüm də aləmlərin Rəbbi olan, heç bir şəriki olmayan Allaha məxsusdur. Mənə ilk müsəl-man kimi bu əmr olunmuşdur!” (əl-Ənam: 162-163).
“Öz Rəbbinə namaz qıl və qurban kəs!” (əl-Kövsər: 2).

Hədis:
Əli ibn Əbu Talibdən (Allah ondan razı olsun!) rəvayət olunur ki, “Peyğəmbər (s.ə.a.s) demişdir: “Allah Allahdan qeyrisinə qurban kəsəni lənətlə-mişdir”. (Qaynaq: Müslim, “əl-Əzahi” (Qurbanlar) kitabının son fəsli, 3/1567).
Mən deyirəm: “Bu dəlillərdən aydın olur ki, qur-ban kəsmək də ibadətdir. Ibadətsə yalnız Allaha məxsusdur. Cin, qəbir və i.a. kimi Allahdan qeyrilə-rinə qurban kəsən şəxs lənətlənməyə, tövbə edənə qədər Allahın mərhəmətindən məhrum edilməyə la-yiqdir. Tövbə edənin tövbəsini Allah qəbul edər”. “Allahdan qeyrisinə qurban kəsənə Allah lənət elə-sin” (hədis).

## ALLAHDAN QEYRISINƏ AND IÇMƏK

Hədislər:
1. Abdulla ibn Ömər (Allah ondan və atasından razı olsun!) demişdir: “Peyğəmbər (s.ə.a.s) görür ki, həcc karvanı içində yol gedən Ömər ibn Xəttab atasına and içir. Peyğəmbər (s.ə.a.s) onları çağı-rıb deyir: “Yox! Qüdrət və Cəlal sahibi Allah sizə öz atalarınıza and içməyi qəti qadağan edir. Əgər and içirsinizsə, yalnız Allaha and için, ya da ki, susun” (Qaynaqlar: Buxari, “Iman” və “Nəzirlər”, 7/221; Müslim, “Iman”, 3/1267).
2. O (Allah ondan və atasından razı olsun!) həm-çinin danışırmış ki, Peyğəmbər (s.ə.a.s) demiş-dir: “And içən yalnız Allaha and içməlidir” (Qay-naq: Müslim, “Iman”, 3/1267).
3. Əbu Hüreyrə (Allah ondan razı olsun!) danı-şırmış ki, Peyğəmbər (s.ə.a.s) demişdir: “Sizdən biri and içəndə andında Lat və Üzzənin adını çək-sə, mütləq “La ilahə illəllah” deməlidir. Öz yol-daşına “gəl qumar oynayaq” deyən onu bir şeylə inan-dırmalıdır”. (Qaynaqlar: Buxari, “Iman” və “Nəzir-lər”, 7/222; Müslim, “Iman”, 3/1267-1268).
4. Büreydə (Allah ondan razı olsun!) danışır-mış ki, Peyğəmbər (s.ə.a.s) demişdir: “Əmanətə and içən bizdən deyildir” (Qaynaqlar: Əbu Davud, “Iman” və “Nəzirlər”, 3/222. Səhih istinadlı hədisdir).
Mən deyirəm: “Peyğəmbər kəlamından gətirilən bu səhih dəlillərdən aydın olur ki, əmanət, çörək, duz, şərəf, ata, baba, Kəbə, Peyğəmbər, qardaşlıq, dostluq, yol yoldaşlığı, əsgəri şərəf, talaq və i.a. bu kimi Allahdan başqa şeylər qadağandır. Həm də aydın olur ki, yalnız və yalnız vahid və şəriksiz Allaha and içmək olar”.

## MÜNƏCCIM SEHRBAZDIRMI?

Hədislər:
Abdulla ibn Abbasdan (Allah ondan və atasından razı olsun!) rəvayət olunur ki, Peyğəmbər (s.ə.a.s) demişdir: “Ulduzlardan elm öyrənən sehrin bir nö-vünə yiyələnmiş olur, özü də artıqlaması ilə” (Qaynaqlar: Əbu Davud, “Təbabət”, 23-cü fəsil, 4/16; Ibn Macə, “Ədəb”, 28-ci fəsil, 2/1228; Əhməd, 1/227 və 311. Səhih hədisdir).
Mən deyirəm: Bu hədisdən aydın olur ki, hər bir münəccim sehrkardır. Adam münəccimlik elminə daha çox yiyələndikcə onun sehrbazlığı da artır.
Allah bizi sehrbaz münəccimlərdən qorusun!

## SEHRBAZ KAFIRDIRMI?

Allah-təala buyurur:

“Yəhudilər Süleymanın səltənətinə dair şeytan-ların oxuduğu (sehr kitablarına) uydular. Lakin Sü-leyman özü bunlara inanmadığı üçün kafir olmadı, lakin şeytanlar sehri və Babildə Harut və Marut adlı iki mələyə nazil olanları xalqa öyrədərək ka-fir oldular. Halbuki o iki mələk: “Biz (Allahın göndərdiyi) sınağıq, sən gəl kafir olma!” deməmiş heç kəsə (sehr) öyrətmirdilər. (Buna baxmayaraq) yə-hudilər yenə də ər-arvad arasına nifaq salan iş-ləri onlardan öyrənirdilər. Lakin onlar (sehr-bazlar) Allahın izni olmadan heç kəsə zərər verə bilməzlər. Onlar (yəhudilər) ancaq özlərinə fay-dası olmayan, zərər verən şeyləri öyrənirdilər. Həqiqətən, yəhudilər belə şeyləri satın alanların Axirətdə payı olmadığını yaxşı bilirlər. Kaş ki, onlar özlərini nə qədər yaramaz bir şeyə satdıq-larını biləydilər! Əgər onlar iman gətirib sehrə uymaqdan çəkinsəydilər, Allah tərəfindən əldə et-dikləri savab daha da xeyirli olardı. Kaş ki, bunu dərk edəydilər!” (əl-Bəqərə: 102-103).

Mən deyirəm: “Biz (Allah) tərəfindən göndəril-miş bir sınağıq, sən gəl kafir olma!” - deməmiş heç kəsə sehr öyrətmirdilər...” (əl-Bəqərə: 102) ayə-sindən aydın olur ki, sehri yalnız kafir adam öyrə-nə bilər, yaxud yalnız kafir adam sehri öyrənər. Bu mübarək ayədən çıxış edərək demək olar ki, sehr-baz kafirdir. Biz küfr, dinsizlik və cəhənnəm əh-linin əməllərindən qorunmaq üçün Allaha sığı-nırıq!

## KAHINLƏRƏ VƏ FALÇILARA INANMAĞIN YASAQ EDILMƏSI

Hədislər:

1. Aişədən (Allah ondan razı olsun!) rəvayət olu-nur ki, camaat Peyğəmbərdən (s.ə.a.s) kahinlər barə-də soruşanda Allahın Rəsulu (s.ə.a.s) onlara dedi: “Onlar heç nədir”. Camaat dedi: “Ya Rəsulullah! Onlar bəzən haqq olan şeylər də deyirlər”. Peyğəm-bər (s.ə.a.s) dedi: “Bu haqq sözləri cinlər yadda saxlayır, onlar toyuq kimi qaqqıldayıb öz ağaları-nın qulağına pıçıldayırlar. Bu vaxt bu sözlərə yüz-lərlə yalan qatılır”. (Qaynaqlar: Buxari üç əsərdə:

1. “Təbabət”, 46-cı fəsil, 7/28;
2. “Ədəb”, 117-ci fəsil, 7/122;
3. “Tövhid”, 57-ci fəsil, 8/218.

Müslim, “Salam kitabı”, 4/1750).

2. Müaviyə ibn Həkəm Səlmi (Allah ondan razı olsun!) demişdir: “Mən dedim: “Ya Rəsulullah! Mən Cahiliyyə dövründən təzəcə ayrılmışam. Allah bizə Islamı bəxş etmişdir. Aramızda elə adamlar var-dır ki, kahinlərə inanırlar”. O dedi: “Kahinlərə inanmayın!”. Mən dedim: “Elələri də vardır ki, fa-la baxırlar”. O dedi: “Bu elə bir şeydir ki, onlar bunu özlərindən deyirlər, siz onlara inanmayın”. (Qaynaqlar: Müslim üç yerdə:

1. “Məscidlər və namaz yerləri”, 7-ci fəsil, 1/381-382;
2. “Salam”, 35-ci fəsil, 4/1748-1749).

3. Peyğəmbərin (s.ə.a.s) bəzi arvadları Peyğəm-bərə (s.ə.a.s) istinadən demişlər: “Falçıya inanıb ondan nəsə soruşanın qırx gecəlik namazı qəbul olunmaz!” (Qaynaq: Müslim, “Səlat kitabı”, 35-ci fə-sil, 4/175).

Mən deyirəm: Kahin hələ baş verməmiş qeyb iş-ləri barədə camaata xəbər verən adamdır. Kahin Mehdi Əmin və başqaları kimi. Həmçinin insanın qəlbində olanlar barədə xəbər verənlər kimi. Ar-tıq kahinlərə inanmağın haram edildiyini bildik. Onlar batil adamlar olub əllərindən bir şey gəl-mir.

Falçı insanlara itmiş, oğurlanmış və bu kimi şeylər barədə xəbər verəndir. Bu şeylər insanlar üçün sirli, məxfidir. Adamlar falçılara müraciət edir, o isə sehrlənmiş (cadu edilmiş), itmiş, oğurlanmış şeylər və ya oğrunun, cadugarın adı və insanlar üçün məxfi, gizli olan bu kimi işlər ba-rədə məlumatlar verirlər.

Məlum oldu ki, falçılara və cadugərlərə inan-maq haramdır. Allah-təala onlara müraciət edənin qırx gecəlik namazını qəbul etmir. Bu da onların kahin və ya falçılara inanmaqda yol verdikləri cinayətə görə cəzadır. Doğru yol tutandan sonra az-maqdan qorunmaq üçün Allah-təalaya sığınırıq.

## DUA VƏ GÖZMUNCUĞU ASMAĞIN YASAQ EDILMƏSI

Hədislər:

1. Uqbə ibn Amir Cəhnidən (Allah ondan razı olsun!) belə rəvayət olunur: "Peyğəmbərə (s.ə.a.s) on dəvə göstərirlər. O, doqquzunu alıb birisini isə saxlayır. Deyirlər: "Ya Rəsulullah! Niyə doqquzunu aldın, yalnız birisini saxladın?" O dedi: "Onun boynunda həmayıl vardır". Sonra əlini uzadıb onu qırdı və kənara tulladı. Onu da alıb dedi: "Göz-muncuğu asan müşrikdir". (Qaynaq: Əhməd, 4/156. Etibarlı hədisdir).

2. Ibad ibn Təmimin rəvayətinə görə, Əbu Bəşir Ənsari (Allah ondan razı olsun!) ona demişdir ki, bir çox səfərlərdə Peyğəmbərlə (s.ə.a.s) bir yerdə olmuşdur. O demişdir: "Peyğəmbər (s.ə.a.s) hər hansı bir elçi göndərəndə tapşırardı: "Dəvənin boynunda heç bir həmayıl və ya sim saxlamayın, belə şeyləri qırıb atın". (Qaynaqlar: Buxari, "Cihad", 4/18; Müslim, "Libas", 38-ci fəsil, 3/1672-1673. Bu hədisə əlavə edilir: Malik demişdir: "Görünür, bu, gözdən qorunmaq üçün imiş").

3. Rüveyf ibn Sabitin (Allah ondan razı olsun!) rəvayətinə görə, Peyğəmbər (s.ə.a.s) demişdir: "Ey Rüveyf, ola bilsin, sən məndən çox yaşayasan. Ca-maata çatdırarsan ki, saqqalı düyünləmək, boyundan sim asmaq, heyvanın peyini və ya sümüyü ilə fala ba-xıb nicat istəmək kimi əməllərə yol verən Məhəm-mədə yaddır" (Qaynaq: Nisai, "Ziynət", 12-ci fəsil, 8/135-136. Səhih istinadlı hədisdir).

Mən deyirəm: Bu hədislərdən məlum oldu ki, til-sim, həmayıl, dua, gözmuncuğu kimi şeyləri istər insanların, istərsə heyvanların boynunda, istərsə də maşınlarında, evlərdə, dükanlarda, ağacda və s. yerlərdə asmaq haramdır. Burada bu asılan şeyin sümük, buynuz, nal, tük, üzərlik, ağac budağı, sim, də-mir, mis və ya qızıl əşya, medalyon və s. olmasının fərqi yoxdur.

Çünki bütün bunlar Allahdan qeyrisinə arxalan-maq, Allahdan qeyrisinə əsaslanmaq, Allahdan qeyri-sinə inanmaq, Allahdan qeyrisinə üz tutmaq və Alla-ha şərik qoşmaq deməkdir. Necə ki, şərafətli Pey-ğəmbər hədisində deyilir: "Dua (və ya gözmuncuğu) asan Allaha şərik qoşmuş olur!".

Buradan həmçinin aşağıdakı kitabları oxumağın təhlükəsi aydınlaşır:

1. Şəmsül-məarif - Biliklər günəşi
2. əl-Məndilüs-Süleymani - Süleymanın qeybi bil-məsi
3. əs-Səbətül-ühud - Yeddi əhd
4. Hərəzül-Cauşən - Cövşən tilsimi
5. Əbu Məşər əl-Fələki - Fiqh evinin astrono-mik təqvimi.

Bu siyahıya başqa sehr, cadu, zəlalət, kahinlik və yalançılıq kitablarını da əlavə etmək olar.

Bu işlərdə köməksiz qalmamaq üçün Allaha pənah aparırıq! Yol azmaqdan qorunmaq üçün Allaha müra-ciət edirik!

## ALLAHDAN BAŞQA QEYBI HEÇ KƏS BILMƏZ

Allah-təala buyurur:

"Allah pisi yaxşıdan ayırmaq üçün möminləri sizin indi olduğunuz vəziyyətdə qoyan deyildir. Al-lah sizə qeybi də bildirən deyildir. Lakin Allah öz peyğəmbərlərindən istədiyi şəxsi seçər (ona qeyb-dən bəzi şeylər bildirər). Buna görə də Allaha və Onun Peyğəmbərlərinə inanın. Əgər inanıb Allah-dan qorxsanız, sizi böyük bir mükafat gözləyir!" (Ali-Imran: 179).

"De ki: "Mən sizə demirəm ki, mənim yanımda Al-lahın xəzinələri vardır. Mən qeybi bilmirəm və sizə də demirəm ki, mən mələyəm. Mən yalnız özümə gələn vəhyə tabe oluram". De ki: "Kor görənlə bir olurmu? Məgər düşünmürsünüz?" (əl-Ənam: 50).

"De ki: "Mən Allahın istədiyindən başqa özümə nə bir xeyir, nə də bir zərər verə bilərəm. Əgər qeybi bilsəydim, sözsüz ki, (özüm üçün) daha çox xeyir tədarük edərdim və mənə pislik də toxunmazdı. Mən iman gətirən bir tayfanı yalnız qorxudan və müj-dələyənəm!" (əl-Əraf: 188).

Nuh (Ona salam olsun!) demişdir: "Mən sizə de-mirəm ki, məndə Allahın xəzinələri vardır. Mən qeybi də bilmirəm. Mən həm də demirəm ki, mən mə-ləyəm. Mən eyni zamanda sizin xor baxdığınız kəs-lərə (mömin kasıblara) Allahın heç bir xeyir ver-məyəcəyini də demirəm. Onların ürəklərində olanı hamıdan yaxşı Allah bilir. (Əgər mən möminləri qovub bu sözləri desəm), onda şübhəsiz ki, zalim-lərdən olacağam" (Hud: 31).

"(Ya Məhəmməd!) De ki: "Allahdan başqa göylərdə və yerdə olanı, qeybi heç kəs bilməz! Onlar yenidən nə vaxt diriləcəklərini də bilməzlər!" (ən-Nəhl: 65).

"Sonra Süleymana ölüm hökmü verdiyimiz zaman onun öldüyünü onlara (cinlərə) Süleymanın əsasını yeyən ağac qurdu xəbər verdi. O ölmüş halda yerə sə-rildikdən sonra cinlərə bəlli oldu ki, əgər onlar qeybi bilsəydilər, alçaldıcı əzab içində qalmaz-dılar" (Səba: 14).

“Qeybin açarları Allahın əlindədir. Onları an-caq Allah bilir. Allah həm suda, həm də quruda olanların hamısını bilir. Elə bir düşən yarpaq yoxdur ki, Allah ondan xəbərsiz olsun. Yerin zül-mətləri içində elə bir toxum, kainatda elə bir şey yoxdur ki, məhz açıq-aydın kitabda (lövhi-məhfuz-da) olmasın” (əl-Ənam: 59).

“Müşriklər: “Barı Peyğəmbərə Rəbbinizdən bir möcüzə nazil ediləydi!” - deyirlər. Onlara belə ca-vab ver: “Qeyb aləmi ancaq Allaha məxsusdur. Elə isə Allahın əzabını gözləyin. Doğrusu, mən də si-zinlə birlikdə gözləyirəm” (Yunus: 20).

“Göylərin və yerin qeybi Allaha məxsusdur. Bütün işlər də axırda Allaha qayıdacaqdır. (Ya Məhəm-məd!) Yalnız Ona ibadət et! Yalnız Ona təvəkkül et! Rəbbin nə etdiklərinizdən qafil deyildir!” (Hud: 123).

“Qeybi bilən ancaq Odur! O, qeybi heç kəsə əyan et-məz!” (əl-Cinn: 26).

“(Ya Məhəmməd!) De ki: “Onların nə qədər qal-dıqlarını Allah daha yaxşı bilir. Göylərin və yerin qeybini yalnız O bilir. O, hər şeyi necə də gözəl görür, necə də yaxşı eşidir! Onların (Göy və yer əhlinin) Allahdan başqa hamisi yoxdur. O heç kəsi Öz hökmünə şərik etməz!” (əl-Kəhf: 26).

Hədislər:

Abdulla ibn Ömərin (Allah ondan və atasından razı olsun!) rəvayətinə görə, Peyğəmbər (s.ə.a.s) de-mişdir: “Qeybin beş açarı vardır, onları yalnız Allah bilir. Allahdan başqa sabah nə baş verəcə-yini heç kəs bilməz. Ana bətnində nəyin olduğunu Al-lahdan başqa heç kəs bilməz. Nəfs sabah nə qazana-cağını bilməz. Nəfsin hansı torpaqda öləcəyini yalnız Allah bilir. Yağışın nə vaxt yağacağını yal-nız Allah bilir. Axirət saatının nə vaxt tamam olacağını yalnız Allah bilir”. (Qaynaqlar: Buxari, dörd yerdə:

1. “Istisqa” (Yağış duası), 2/23;
2. “əl-Ənam surəsinin təfsiri”, 5/193;
3. “Tövhid”, 8/165-166;
4. “Loğman” surəsinin təfsiri, 6/21.

Əhməd, 2/52. Səhih istinadlı hədisdir).

Mən deyirəm: Bu mübarək ayələrdən və şərafətli Peyğəmbər hədisindən hər şeyi başa düşən oxucuya kahinlər, fala baxan qadınlar və başqa bu kimi azğın və yoldan çıxmış kahin və falçıların əməl-lərinin batil olduğu aydınlaşır. Həm də aydın olur ki, vahid və şəriksiz Allahdan başqa heç kəs qeybi bilmir.

## YALNIZ VAHID ALLAHA TƏVƏKKÜL ETMƏYIN VACIBLIYI

Allah-təala buyurur:

“(Ya Məhəmməd!) Allahın mərhəməti səbəbinə sən onlarla (fərarilərlə) yumşaq rəftar etdin. Əgər sərt ürəkli olsaydın, əlbəttə, onlar sənin ət-rafından dağılıb gedərdilər. Artıq sən onları əfv et. Onlar üçün (Allahdan) bağışlanmaq dilə, işdə onlarla məsləhətləş, qəti qərara gəldikdə isə Allaha təvəkkül et! Həqiqətən, Allah (Ona) tə-vəkkül edənləri sevər!” (Ali-Imran: 159).

“(Ya Məhəmməd!) Onlar: “(Sənə) itaət edirik!” - deyir, lakin sənin yanından çıxıb getdikləri zaman onların bir qismi dediyinin əksinə fikirləşir. Allah onların niyyətində onları (əməl dəftərlə-rinə) yazır. Sən onlardan üz çevir. Allaha təvəkkül et! Allahın (sənə) vəkil olmağı kifayət edər!” (ən-Nisa: 81).

“Əgər onlar barışığa meyl etsələr, sən də barı-şığa meyl et və Allaha təvəkkül elə! Həqiqətən, Al-lah (hər şeyi) eşidən və biləndir!” (əl-Ənfal: 61).

“Ya Məhəmməd! Ölməz və həmişə diri olana tə-vəkkül elə. Ona həmdü-səna ilə zikr et! Onun bəndə-lərin günahlarından xəbərdar olması kifayətdir!” (əl-Furqan: 58).

“Yenilməz qüdrət və mərhəmət sahibinə, Səni na-maza duranda da, səcdə edənlər arasında olanda da Görənə təvəkkül et! O hər şeyi Eşidən və Bilən-dir!” (əş-Şüəra: 217-220).

“(Ya Məhəmməd!) Sən ancaq Allaha təvəkkül et, çünki sən açıq-aydın həqiqi dindəsən” (ən-Nəml: 79).

“Musa dedi: “Ey mənim tayfam! Əgər Allaha iman gətirmişsinizsə və müsəlman olmuşsunuzsa, Ona təvəkkül etməlisiniz”. Onlar dedilər: “Biz Allaha təvəkkül etmişik. Ya Rəbbimiz! Bizi zalım tayfa-nın fitnə-fəsadına düçar etmə. Bizi öz mərhəmə-tinlə kafir tayfalardan xilas et!” (Yunus: 84-86).

“Allahdan qorxan və Allahın nemətlər bəxş et-diyi iki nəfər dedi: “Siz şəhər qapısından girin. Əgər girsəniz, qalib gələcəksiniz. Möminsinizsə, Allaha təvəkkül edin!” (əl-Maidə: 23).

“Peyğəmbərləri onlara cavab verərək demişdi-lər: “Bəli, biz də sizin kimi adi bir insanıq. La-kin Allah öz bəndələrindən istədiyinə (Peyğəmbər-lik) neməti bəxş edir. Allahın izni olmadan biz sizə heç bir dəlil (möcüzə) gətirə bilmərik. Mö-minlər Allaha təvəkkül edirlər.

Biz yalnız Allaha təvəkkül etməliyik. Allah bizə hidayət və mərhəmət yolunu göstərmişdir. Biz si-zin yağdırdığınız yalan və iftiralara dözməliyik. Təvəkkül edənlər yalnız Allaha bel bağlayırlar!" (Ibrahim: 11-12).

Hədis:
Ömər ibn Xəttabın (Allah ondan razı olsun!) rə-vayətinə görə o, Peyğəmbərdən (s.ə.a.s) bu sözləri eşitmişdir: "Əgər siz Allaha haqq olaraq təvəkkül etsəniz, O sizə ruzi bəxş edər. Necə ki, səhəri boş mədəylə açıb günü dolu qarınla başa vuran quşa ruzi bəxş edir". (Qaynaqlar: Tirmizi, "Zühd", 23-cü fəsil, 4/573; Ibn Macə, "Zühd", 14-cü fəsil, 2/1394; Əhməd, 1/30. Onun mətnidir).

## BIDƏTIN TƏRIFI

BIDƏT - Peyğəmbərin (s.ə.a.s) vəfatından sonra Kitab və Sünnədən heç bir dəlili olmadan ibadət və itaət məqsədilə meydana gələn hər bir yeni fi-kir, söz və ya əməldir.
Bidətin beş növü vardır. Onların hamısı zə-lalət olub bir-birindən daha zərərlidir.
1. FIKIR BIDƏTI
Kitab və Sünnəyə müxalif hər bir fikir (ideya) və ya etiqad.
2. SÖZ BIDƏTI
Insanın Kitaba və Sünnəyə müxalif olan və iba-dət niyyətilə dilə gətirdiyi söz.
3. ƏMƏL BIDƏTI
Insanın ibadət niyyətilə yol verdiyi, Kitab və Sünnəyə müxalif olan hərəkət.
4. SƏRVƏT BIDƏTI
Kitaba və Sünnəyə müxalif olan bir şeyə ibadət niyyətilə sərvət sərf edilməsi.
5. INKAR BIDƏTI
Dinə aid olan və ya icazə verilənlərin ibadət niyyətilə inkar edilməsi. Məsələn, ibadət və za-hidlik niyyəti ilə nikahı və ya ət yeməyi inkar edən şəxs kimi (bu barədə müfəssəl şəkildə aşağıda danışılacaqdır).

## DINDƏ BIDƏTƏ YOL VERMƏKDƏN ÇƏKININ

Hədislər:
1. Aişədən (Allah ondan razı olsun!) verilənlərdən rəvayət olunur ki, Peyğəmbər (s.ə.a.s) demişdir: "Bizim işimizə (dinimizə - Z.Q.) aid olmayan yeni bir şey icad edən şəxs rədd edilməli-dir" (Qaynaqlar: Buxari, "Sülh", 3/167; Müslim, "əl-Əqziya" (Qəzalar), 3/1343. Müslimin rəvayətində (3/1344) mətn belədir: "Bizim işimizə (dinimizə) aid olmayan hərəkətə yol verən şəxs rədd edilir".
2. Cabir ibn Abdullanın (Allah ondan razı ol-sun!) rəvayətinə görə, Peyğəmbər (s.ə.a.s) xütbədə de-mişdir: "Ən gözəl kəlam Allahın kitabıdır, ən gö-zəl hidayət Məhəmmədin göstərdiyi haqq yoludur. Ən şər əməl yenilikçilikdir. Hər bir yenilik bidət-dir. Hər bir bidət zəlalətdir (yol azmaqdır -Z.Q.). Hər bir zəlalət Cəhənnəmlikdir" (Qaynaqlar: Müs-lim, "Cümə", 13-cü fəsil, 2/592. Mətn bu mənbədən-dir. Nisai, "Idan", 23-cü fəsil,3/188-189. Iki əla-vəsi ilə)

Müsəlman qardaş! Nübüvvət çırağından çıxmış bu iki şərafətli, nübüvvət işıqlı səhih hədis ba-rədə fikirləş, onlara dərindən nəzər salıb, in-şallah, Allahın dinində icad edilmiş hər bir bidətdən özünə şəfa tapacaqsan. Çünki Peyğəmbər (s.ə.a.s) bidət barədə hökm verərək onun zəlalət olduğunu bildirir. Gördüyün kimi, Salavatullah "bəzi" deyil, "hər bir" deyir. Yəni, ey müsəlman qardaş, "hər bir" sözü "bütün", "ümumiyyətlə" məna-sındadır. Həmçinin Allahın ən gözəl salavat və salamının sahibi deyir: "Bizim işimizə (dinimi-zə) aid olmayan əmələ yol verən şəxs rədd edilir". Yəni rədd edilir, qəbul edilmir. Demir ki, "bu əməl sahibinin niyyətinə görə", əksinə, qəti hökm verir: rədd edilir!
Əgər sənə desələr ki, "hər bir bidət zəlalət de-yildir, dində icad edilən hər bir hərəkət rədd edilmir" sən belə cavab ver: "Bu məsələni kim daha yaxşı bilir: sən, yoxsa Peyğəmbər (s.ə.a.s)? Kim da-ha çox müttəqidir (Allahdan qorxandır - Z.Q.): sən, yoxsa Peyğəmbər (s.ə.a.s)?" Əgər açıq şəkildə bu iki hədislə razılaşsa, onları qəbul edir və onlara əməl edir. Lakin əgər öz sözünün üstündə israr edib "hər bir bidət zəlalət deyildir. Hər bir ye-nilik rədd edilmir" desə, ona belə cavab ver: "Peyğəmbər (s.ə.a.s) bu münasibətlə demişdir: "Hər bir bidət zəlalətdir". Həmçinin demişdir: "Bi-zim işimizə (dinimizə) aid olmayan hərəkətə

yol verən şəxs rədd edilir”. Sən isə başqa bir müna-sibətlə deyirsən: “Hər bir bidət zəlalət deyildir, nə də hər bir yeni hərəkət rədd ediləndir”. Bu sə-nin sözündür, Peyğəmbərin (s.ə.a.s) üzünə ağ olmaq deməkdir!!!

Həm də bu adama Allah Sübhanəhu-təalanın bu sözlərini xatırla: “Hər kəs özünə doğru yol aşkar olandan sonra Peyğəmbərdən üz döndərib möminlə-rin yolundan fərqli bir yola uyarsa, onu istədiyi yo-la yönəldər və Cəhənnəmə varid edərik. Ora necə də pis yerdir!” (ən-Nisa: 115).

Bizi Kitab və Sünnəyə bağla, bütün bütlərdən xi-las et, ya Rəbbəlaləmin!

## QƏBIRLƏR ÜZƏRINDƏ SƏRDABƏLƏR VƏ GÜNBƏZLƏR TIKMƏK BARƏDƏ HÖKM

Hədislər:

1. Cabir ibn Abdullanın (Allah ondan razı ol-sun!) hədisi: Peyğəmbər (s.ə.a.s) aşağıdakı əməllə-ri yasaq etmişdir:

- qəbri ucaltmağı,
- qəbir üstə oturmağı,
- qəbir üstünü tikməyi (məşhəd, qübbə, sərdabə və s.).(Qaynaq: Müslim, “Cənazələr” kitabı, 2/667).

2. Əbul Hiyac Əsədinin rəvayətinə görə, Əli ibn Əbu Talib (Allah ondan razı olsun!) ona demişdir: “Mən səni Peyğəmbərin (s.ə.a.s) məni sövq etdiyi “Dağılmamış heykəl və yerlə bərabərləşdirilmə-miş qəbir qoyma!” kimi əməllərə sövq etməyimmi?” (Qaynaq: Müslim, “Cənazələr” kitabı, 2/666).

Bu iki hədisdən aşağıdakı nəticələr çıxır:

1 - qəbirlərin üstünü tikmək yasaqdır,
2 - onları çox ucaltmaq yasaqdır,
3 - qəbirlər üstə oturmaq yasaqdır,
4 - ölülərin şəklini qoymaq yasaqdır,
5 - belə şəkillər (və heykəllər) varsa, onları dağıtmaq vacibdir,
6 - qəbir üstündə bir şibrdən (22.5 sm.dən) hün-dür hər bir tikilini dağıtmaq vacibdir.

Mərhum alim Şövkani demişdir: “Bütün bunlar-la tanışlıqdan sonra bildik ki, Peyğəmbər (s.ə.a.s) yuxarıda deyildiyi kimi, bəzən qəbirləri qaldır-mağı, üstündə sərdabələr, günbəzlər və məscidlər tikəni lənətləmiş, bəzənsə demişdir: “Öz pey-ğəmbərlərinin məzarlarını məscidə çevirən tay-faya Allahın qəzəbi artır”. O belə adamları bu növ asiliyə yol verməklə Allahın qəzəbini artır-maqdan çəkindirmişdir. Peyğəmbər (s.ə.a.s) bir halda bütün bunları yasaq etmiş, bəzən tikililəri dağıtmağa adam göndərir, başqa vaxt bunu yəhudi və xristianların əməli hesab etmişdir. O bəzən de-yərdi: “Mənim qəbrimi bütə çevirməyin!” və ya “Mə-nim məzarım üstə bayram keçirməyin”, yəni xüsusi bir vaxtda onun üzərində toplanmayın. Necə ki, in-di qəbirlərə ibadət edənlərin əksəriyyəti bu əmələ yol verir, etiqad etdikləri ölülərin məzarını zi-yarət etmək üçün xüsusi vaxt müəyyənləşdirir və on-ların məzarı üstünə yığışıb nəzir verir, onlara itaət edirlər. Bu cür əməli hər kəs insanları yara-dan, onlara ruzi verən, onları öldürüb-diriləndən Allaha ibadəti qoyub üstünə tökülən sərvətin altın-da batıb qalan, özünə bir mənfəət qazanmağa, nə də ki, özündən hər hansı bir zərəri uzaqlaşdırmağa qadir olan Allah bəndələrinə ibadət edən kömək-siz adamların gördükləri işlər də müşayiət edir. Peyğəmbər (s.ə.a.s) Allahın hökmünü yerinə yetirərək demişdir: “De ki: “Mən Allahın istədiyindən baş-qa özümə nə bir xeyir, nə də bir zərər verə bilə-rəm. Əgər qeybi bilsəydim, sözsüz ki, (özüm üçün) da-ha çox xeyir tədarük edərdim və mənə pislik də to-xunmazdı. Mən iman gətirən bir tayfanı yalnız qorxudan və müjdələyənəm!” (əl-Əraf: 188).

Bax gör bəşərin ağası və Allahın məxluqları-nın ən pakı öz Rəbbinin əmri ilə deyir ki, özünə nə zərər, nə də xeyir verə bilər. Həmçinin onun haq-qında səhih hədisdə deyilir: “Ey Məhəmmədin qızı Fatimə! Mən Allahdan sənin üçün bir şey uma bil-mərəm!” Əgər Peyğəmbərin (s.ə.a.s) özü ən istəkli və ən yaxın övladı barədə bu sözləri deyirsə, bəs on-da nə məsum (günahsız - Z.Q.) peyğəmbər, nə göndə-rilən elçilər olan, yalnız və yalnız Məhəmməd üm-mətinin bir fərdi olan, Islam millətinin üzvlə-rindən biri olan bu ölülərə nə düşüb? Bunlar özü-nə bir xeyir verməkdə və ya zərəri kənarlaşdır-maqda çox-çox acizdirlər. Necə ola bilər ki, onlar Peyğəmbərin (s.ə.a.s) belə aciz olduğu bir işdə aciz olmasınlar?! Peyğəmbər (s.ə.a.s) həm özü bu barədə öz millətinə demişdir, həm də onun haq-qında olan hədislərdə bu barədə deyilir. Məgər Allah-təala ona özünə nə xeyir nə də zərər verə bi-ləcəyinə deməyi, həm də öz ən əziz adamı üçün Al-lahdan heç nə ummamağı əmr etməmişdirmi? Necə ola bilər ki, ən az elm, ən aşağı bilik sahibi olan bir fərddən ona xeyir verməyi və ya ondan zərəri uzaqlaşdırmağı istəsin?! Xüsusilə, əgər bu fərd Peyğəmbərin (s.ə.a.s)

ardıcıllarından və onun şə-riətinə tabe olanlardan biridirsə! Sənin qulaqla-rın - Allah səni düz yola yönəltsin - məzarlara iba-dət edənlərin azğınlığından böyük bir azğınlıq eşitmişdirmi?

"Biz Allaha məxsusuq və ona da qayıdırıq!" (əl-Bəqərə: 156).

## MƏZARLARA NAMAZ QILMAĞIN YASAQ EDILMƏSI

Hədislər:

Əbu Mərsəd Qənəvinin (Allah ondan razı olsun!) rəvayətinə görə, Peyğəmbər (s.ə.a.s) demişdir: "Qə-birlərə (üz tutub) namaz qılmayın və onların üs-tündə oturmayın!" (Qaynaq: Müslim, "Cənazələr" kita-bı, 33-cü fəsil, 2/668).

Mən deyirəm: Bu mətn qəbirlərə üz tutub namaz qılmağın, onların üstündə oturmağın haram olduğu-nu aydın şəkildə göstərir. Əsas qaydalarda deyil-diyi kimi: "Hədisin yasaq bildiyini etmək haram-dır". Burada bunu inkar edən yoxdur. Allahın və Onun Peyğəmbərinin (s.ə.a.s) əmrlərinə müxalif olanlar qoy Allahdan qorxsunlar və Sübhanəhu-təa-lanın bu buyruğunu unutmasınlar: "...Onun (Allahın və ya Peyğəmbərin) əmrinə qarşı çıxanlar başla-rına gələcək bir bəladan, yaxud düçar olacaqları şiddətli bir əzabdan özlərini qorusunlar!" (ən-Nur: 63).

## BƏZI MƏZARLARI HƏR IL XÜSUSI OLARAQ ZIYARƏT ETMƏK BARƏDƏ

Sual: Bəzi qəbirləri hər il xüsusi olaraq həyata keçirilən və ələlxüsus rəqslərlə, qadın və kişi-lərin bir-birinə qarışması və bu kimi qadağan edilən əməllərlə müşayiət olunan ziyarətlər şə-riətə uyğundurmu?

Cavab: Bəzi məzarlara hər il xüsusi olaraq həya-ta keçirilən, üzərində rəqslərin, qadınlarla ki-şilərin bir-birinə qarışması və bu kimi qadağan edilən əməllərlə müşayiət olunan ziyarətlər nəin-ki şəriətə uyğun deyil, bu, əslində, dinə yenilik gə-tirmək deməkdir. Allahın hökm verib nazil etmə-diyi pis əlamətlərdəndir. Islam əxlaqının və də-yərlərinin böhran keçirdiyinə dəlalət edən bu cür murdar adətləri dəyişmək məsul şəxslərin (Allah bizi və onları həmişə haqqla bağlı etsin!) və alimlərin (Allah bizə və onlara uğur bəxş etsin!) borcudur.

Bidətdən çəkindirən dəlillər barədə artıq da-nışıldı, onlara bir daha müraciət et. Bu əməl də bidətin bir növüdür. Çünki adamlar şəriət dəlili olmadan bəzi məzarları ziyarət etmək üçün xüsusi bir zaman, məkan və qəbir ayırırlar.

Bu əmələ bir çox qadağan olunan və şirk əməllər də qarışır. Allah bizi onlardan qorusun! Həmçi-nin bilin ki, Allah məni və sizi qəbirlərə ziya-rətin üç növü barədə biliklə müvəffəq etmişdir. Bunlar aşağıdakılardır:

1 - şəriətlə olan ziyarət,

2 - bidətə yol verməklə olan ziyarət,

3 - şirk olan ziyarət.

Şəriətlə olan ziyarət Islam dininin aşağıda göstərilən iki şərtlə qanuni bildiyi ziyarətdir:

a) qəbir üstünə xüsusi olaraq ziyarət məqsədilə gəlməsinlər:

Hədislər:

Əbu Səid Xudrinin (Allah ondan razı olsun!) rə-vayətinə görə, Peyğəmbər (s.ə.a.s) demişdir: "Aşa-ğıdakı üç məsciddən başqa yerdə qalanlarına səfə-rə çıxmayın: Mənim məscidimə (Mədinə məscidinə - Z.Q.), əl-Əqsa məscidinə (Qüds məscidinə - Z.Q.), Haram məscidinə (Kəbəyə - Z.Q.)" (Qaynaq: Müslim, "Həcc", 3/976).

b) qəbir üstündə olanda ədəbsiz söz dilə gətir-məsinlər.

Hədislər:

Büreydənin (Allah ondan razı olsun!) rəvayətinə görə, Peyğəmbər (s.ə.a.s) demişdir: "Mən sizə qə-birləri ziyarət etməyi qadağan edirəm. Istəyir-siniz, gedin!" (Qaynaqlar: Müslim, "Cənazələr" kita-bının son fəsli, 2/672; Nisai bu hədisi "Cənazə-lər" kitabında (100-cü fəsil, 4/89) belə mətndə rəvayət edir: "Mən sizə qəbirləri ziyarət etməyi qa-dağan etdim. Lakin kim istəyir, qoy getsin, amma pis söz dilə gətirməsin". Səhih hədisdir).

Allahın ən gözəl salavat və salam sahibinin bu kəlamı da vardır: "...Biədəb söz deməyin".

Mən deyirəm: Allah sənə rəhm eləsin, bax gör Peyğəmbərimiz (s.ə.a.s) qəbirləri ziyarət edərkən pis və ədəbsiz söz deməyi bizə necə qadağan edir! Allahı qoyub ölülərə dua etməkdən, Allahı qoyub on-lardan kömək diləməkdən pis, biədəb nə ola bi-lər?! Allaha and olsun ki, bu, ən böyük ədəbsizlik və qəbahətdir!

Allahın buyurduğu kimi: “Lakin adam-ların çoxu bilmirlər”. Bu mübarək ayə Qurani-kərimdə on bir yerdə işlənmişdir: əl-Əraf: 187, Yusif: 21, 40 və 68, ən-Nəhl: 38, ər-Rum: 6 və 30, Səba: 36 və 38, Ğafir (və ya əl-Mumin): 57 və əl-Casiyə: 36.

Böyük Allah nə qədər doğru buyurur:

“Onların əksəriyyəti Allaha yalnız müşrik ola-raq inanırlar” (Yusif: 106).

2) Bidətə yol verməklə olan ziyarətlərdə hər şey bir yana, yuxarıda göstərilən hər iki şərt yerinə yetirilmir.

3) Şirk olan ziyarətlər zamanı ziyarət edən şəxs Allahdan qeyrisinə dua etmək, qurban kəsmək, nəzir vermək, onları köməyə çağırmaq, onlara pənah aparmaq və ya sığınmaq kimi Allaha şərik qoşmaq əməlinə yol vermiş olur.

## MƏZARLARI YOLLARA, STADIONLARA VƏ YA AVTOMOBIL DAYANACAQLARINA ÇEVIRƏNLƏR HAQQINDA HÖKM

Sual: Məzarları yollara, avtomobil dayanacaqla-rına çevirmək, üzərində dükanlar tikmək və s. təh-qirlərə yol vermək olarmı?

Cavab: Istər dirilərə, istərsə də ölülərə zülm və təcavüz etmək haramdır. Xüsusilə ölülərə zülm daha çox haramdır. Bu barədə şərafətli Peyğəmbər hədisində deyilir:

Əbu Hüreyrənin (Allah ondan razı olsun!) rəvayə-tinə görə, Peyğəmbər (s.ə.a.s) demişdir: “Bir kəsin köz üstə oturub bu közün onun paltarını dərisinə qədər yandırması onun qəbir üstündə oturmasından yaxşıdır” (Qaynaq: Müslim, “Cənazələr” kitabı, 33-cü fəsil, 2/667).

Mən deyirəm: Allaha və Axirət gününə inanan mü-səlman istər diri, istərsə də ölü müsəlman qarda-şına əziyyət verməməlidir və həmişə də məzarla-rı yollara, bazarlara çevirməyə, onların üstündə oturmağa mane olmalıdır.

Alimlər həqiqəti izah etmək vəzifəsini yerinə yetirməlidirlər! Allah uğurlar bəxş edəndir!

## MÜSƏLMANLARA ƏZIYYƏT VERMƏYIN HARAM OLMASI BARƏDƏ

Imam Tirmizinin öz toplusunda verdiyi hədis (4/331, 2032) aşağıdakı şəxslərə istinadən rəva-yət edilir: Yəhya ibn Əksəm Carud ibn Müaz, Fəzl ibn Musa, Hüseyn ibn Vaqid Övfi ibn Dəlhəm, Nafi və Ibn Ömər: “Peyğəmbər (s.ə.a.s) minbərə qalxıb uca səslə dedi: “Ey sözdə Islamı qəbul edib imanı hələ qəlbində yerləşdirməyənlər. Müsəlmanlara əziyyət verməyin, onları utandırmayın, onların eyiblərini üzə vurmayın! Öz qardaşı müsəlmanın eybini (fiziki nöqsanını - Z.Q.) üzə vuranın eybini Allah üzə vurar. Allah kimin eybini üzə vursa, bu adam miniyin qarnına girsə belə, ifşa edilər”.

Mən deyirəm: Allaha şükür ki, bu hədis səhihdir. Müsəlmanlara əziyyət verməyi, onları utandırmağı, fiziki nöqsanlarını üzə vurmağı yasaq edir.

## EVLƏRIN VƏ ONLARIN SAKINLƏRININ NÖVLƏRI

Evlər üç cürdür:

1. Dünya evi;
2. Bərzəx evi;
3. Axirət evi.

Bu üç evin sakinləri də üç qismə bölünür, hər nö-vün də öz növləri vardır:

1. Möminlər - növləri vardır;
2. Münafiqlər - növləri vardır;
3. Kafirlər - növləri vardır.

Möminlərin iki növü vardır:

1. Ən birincilər - onlar Peyğəmbərə (s.ə.a.s) ən yaxın olanlardır.
2. And sahibləri - onlar mömin, dindar adam-lardır.

# NIFAQ

Nifaq iki cür olur:
1. Etiqadda; 2. Əməldə
Istəsən, deyə bilərsən:
1. Böyük nifaq;
2. Kiçik nifaq
Əgər istəsən, de:
1. Islam ümmətindən xaric edən nifaq;
2. Islam ümmətindən xaric etməyən nifaq.
Istəsən, de:
1. Küfr nifaqı;
2. Əməl nifaqı. (Bax: Zəhəbi, "əs-Siyər" kitabı, 1/363).

Etiqadda olan nifaq ən böyük olub öz sahibini Islam ümmətindən xaric edir. Bu, küfr nifaqıdır ki, sahibi zahirən özünü müsəlman kimi göstərsə də, küfrünü gizli saxlamış olur.

Əməldə olan nifaq nisbətən kiçikdir, öz sahi-bini Islamdan xaric etmir. Onun növləri vardır:
1. Yamana yol vermək;
2. Vədə xilaf çıxmaq;
3. Əmanətə xəyanət etmək;
4. Andı pozmaq;
5. Rəqabəti biabırçılığa çevirmək;
6. Döyüşdən qaçmaq.
Münafiqlər iki cürdürlər:
1. Tamamilə münafiq olan adam;
2. Yalan nifaqın hissəsinə malik olan adam.

# KÜFR

Küfrün iki növü vardır:
1. Etiqadda küfr;
2. Əməldə küfr.
Deyə bilərsən:
1. Böyük küfr;
2. Kiçik küfr.
Deyə bilərsən:
1. Islam ümmətindən xaric edən küfr;
2. Islam ümmətindən xaric etməyən küfr.

Etiqadda küfr ən böyük olub öz sahibini Islam ümmətindən xaric edir. Bu küfrün aşağıdakı növ-ləri vardır:
1. Təkzib küfrü;
2. Imansızlıq küfrü;
3. Inkar küfrü;
4. Istehza və gülüş küfrü.
5. Imtina küfrü;
6. Inadkarlıq küfrü;
7. Dinsizlik küfrü (ilhad);
8. Şirk küfrü;
9. Şəkk küfrü;
10. Müqavimət küfrü;
11. Nifaq küfrü;
12. Zindiqlərin küfrü. (Bu barədə bax: "ət-Təhavi"nin şərhi", səh.342);
13. Islam düşmənlərinə bağlılıq küfrü;
14. Islamdan üz döndərmək küfrü (riddə);
15. Münəccimlərin və sehrbazların küfrü.

Qeyd: “Evlərin və onların sakinlərinin növləri” adlı bu fəslə aid dəlil və sübutlar çoxdur və ha-mıya məlumdur.

Əməldə yol verilən küfr nisbətən daha kiçik olub öz sahibini Islam ümmətindən xaric etmir. Onun aşağıdakı növləri vardır:

1. Nemətə uymaq küfrü;
2. Qardaşlıq küfrü;
3. Yaxınlıq küfrü;
4. Nəslə tənə etmək küfrü;
5. Ölü üstə hay-küylə ağlamaq küfrü;
6. Atadan imtina küfrü.

Kafirlər iki cürdürlər:

1. Əslən kafir olanlar;
2. Mürtəd (dindən üz döndərən) kafirlər.

Həmçinin daha iki növü vardır:

1. Küfrə çağıran kafirlər;
2. Başqalarını təqlid edən kafirlər.

## ŞIRK (ALLAHA ŞƏRIK QOŞMAQ)

Şirkin iki növü vardır:

1. Etiqadda şirk;
2. Əməldə şirk.

Deyə bilərsən:

1. Böyük şirk;
2. Kiçik şirk.

Deyə bilərsən:

1. Islamdan xaric edən şirk;
2. Islamdan xaric etməyən şirk.

Deyə bilərsən:

1. Küfr şirki;
2. Əməl şirki.

Etiqadda şirk ən böyük olub öz sahibini Islam ümmətindən xaric edir. Bu, küfr şirki olub aşağı-dakı növlərə malikdir:

1. Rübubiyyətdə şirk;
2. Üluhiyyətdə şirk;
3. Adlarda və sifətlərdə şirk.

Kiçik şirk əməldə yol verilən şirk olub öz sa-hibini Islam ümmətindən xaric etmir. Onun da öz növləri vardır:

1. Riyakarlıq və saxtakarlıq şirki;
2. Gizli şirk;
3. Söz şirki.

## BIDƏT

Bidətin iki növü vardır:

1. Böyük bidət;
2. Kiçik bidət.

Deyə bilərsən:

1. Küfr doğuran bidət;
2. Fitnə-fəsad doğuran bidət. (Bax: Ibn Həcər Əsqalani, “Hüda əs-Sari”, səh.385).

Deyə bilərsən:

1. Islamdan xaric edən bidət;
2. Islamdan xaric etməyən bidət.

Ən böyük bidət küfr doğurur, öz sahibini Islam-dan xaric edir, onu küfr həddinə gətirib çıxarır.

Kiçik bidət isə fitnə-fəsad doğurur, sahibini ümmətdən xaric etmir, onu küfr həddinə çatdır-mır. Bidətçilər iki cürdürlər:

1. Başqalarını öz bidətinə dəvət edənlər;
2. Öz bidətinə çağırmayanlar. (Bax: Ibn Həcər Əsqalani, "Hüda əs-Sari", səh.70).

## SON SÖZ

Bu sonluqla kifayətlənirəm. Allahdan arzum bu-dur ki, bütün əməllərim kimi bunu da öz mübarək camalına layiq bilsin, bütün müsəlmanları Kitab və Sünnə əsasında birləşdirsin, haqq əhlinə kö-məkçi olsun, şər əhlini xəcil etsin, müsəlmanları öz dinlərindən agah etsin! Allahın ən gözəl və ən yaxşı salavatı və salamı onun qulu və elçisi Məhəmmədə (s.ə.a.s) olsun!

SÜBHANƏLLAH, Sənə həmdü-səna ilə!

Şəhadət verirəm ki, səndən başqa tanrı yoxdur.

Səndən bağışlanmaq diləyirəm, Sənə tövbə edi-rəm.

## KITAB BARƏDƏ

Hər bir elm və bilik axtaran onu tamamilə əzbərləməlidir. Hər bir müəllimin vəzifəsi onu öz tələbəsinə yaxşıca əzbərlətdirməkdir. Çünki bu Kitab və Sünnədə öz əksini tapan müsəlman əqidə-sini əhatə edir.

Bu kitabda yüz doxsan mübarək Quran ayəsinə is-tinad edilir.

Bu kitabda qırx üç şərafətli Peyğəmbər hədi-sinə istinad edilir

Ey müsəlman qardaş! Sənin birinci vəzifən onu öyrənməkdir. Öyrəndiyin tövhiddir. Sən onu sabit Kitab və Sünnə əsasında öyrənirsən. Qarşındakı kitab bu işdə sənə kömək edəcəkdir. Özün də onu əzbərlə, başqalarına da əzbərlətdir!

Məllif.
Səna şəhəri, 23 cümadi əl-üla, 1406 h.

## KITABIN IÇINDƏKILƏR

Mövzular: səh.